QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

May 2017
№ 3 (1082)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ


## Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi haqqında
## Azərbaycan Respublikası Prezidentinin Sərəncamı



2018-ci il may ayının 28-də müsəlman Şərqində ilk parlamentli respublikanın - Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100 illiyi tamam olur.

Qədim və zəngin dövlətçilik ənənələrinə malik Azərbaycan xalqı keçmişinin müəyyən dövrlərində tarixin hökmü ilə böyük imperiyalar tərkibinə qatılmaq məcburiyyətində qalmışdır. Azərbaycan Xalq Cümhuriyyəti məhz dünyanın siyasi nizamının yenidən qurulduğu bir vaxtda, XIX əsrin axırları və XX əsrin əvvəllərində Azərbaycanın yaşadığı parlaq mədəni yüksəliş mərhələsinin məntiqi yekunu kimi meydana çıxmışdır.

XIX əsrin birinci yarısından etibarən maarifçilik ideyalarının yayılması ilə Azərbaycanda baş vermiş köklü ictimai-siyasi və mədəni dəyişikliklər yeni tipli teatrın, məktəbin və mətbuatın yaranmasını təmin etməklə milli özünüdərkin gerçəkləşməsi üçün zəmin hazırladı. Abbasqulu ağa Bakıxanov və Mirzə Fətəli Axundzadə ilə başlayan bu yolu yeni tarixi mərhələdə Həsən bəy Zərdabi, Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Əli bəy Hüseynzadə və digər görkəmli şəxsiyyətlər davam etdirərək milli məfkurənin təşəkkülü və inkişafına mühüm təsir göstərirdilər. Həmin dövrdə güclü sahibkarlar təbəqəsinin formalaşdığı neft şəhəri Bakı eyni zamanda milli ruhlu ziyalılar nəslinin yetişdiyi ictimai-siyasi fikir mərkəzinə çevrilmişdi. Rusiyanın Dövlət dumalarına və Müəssislər Məclisinə seçilmiş azərbaycanlılar müstəmləkədən azad, demokratik dövlət sistemi yaratmağa hazır idilər.

Bununla yanaşı, Rusiyada çarizmin süqutundan sonra bolşeviklərin hakimiyyəti ələ keçirməsi ilə keçmiş imperiya ərazisində mürəkkəb geosiyasi vəziyyət yaranmışdı. Dünyanın aparıcı dövlətlərinin Bakı neftinə marağının siyasi çarpışmaları daha da gərginləşdirdiyi belə bir şəraitdə Azərbaycanın tərəqqipərvər siyasi elitası müstəqil milli dövlətçiliyin yaradılması naminə birləşdi.

1918-ci il may ayının 28-də Azərbaycanın müstəqilliyini bəyan edən İstiqlal Bəyannaməsi qəbul edildi. Yeni qurulan Azərbaycan Xalq Cümhuriyyəti öz üzərinə götürdüyü çətin tarixi vəzifəni imkanlarının ən son həddində çalışaraq şərəflə yerinə yetirdi. Azərbaycanın ilk parlamenti və hökuməti, dövlət aparatı təşkil edildi, ölkənin sərhədləri müəyyənləşdirildi, bayrağı, himni və gerbi yaradıldı, ana dili dövlət dili elan edildi, dövlət quruculuğu sahəsində ciddi tədbirlər həyata keçirildi. Ölkənin ərazi bütövlüyü və milli təhlükəsizliyi təmin edildi, qısa müddətdə yüksək döyüş qabiliyyətli hərbi hissələr yaradıldı, milli tələblərə və demokratik prinsiplərə uyğun dövlət orqanları quruldu, maarifin və mədəniyyətin inkişafına xüsusi diqqət yetirildi, Azərbaycanın ilk universiteti təsis olundu, təhsil milliləşdirildi, xalqın sonrakı illərdə mədəni yüksəlişi üçün zəmin hazırlayan, ictimai fikir tarixi baxımından müstəsna əhəmiyyətli işlər görüldü.

Mövcudluğunun ilk günlərindən xalq hakimiyyəti və insanların bərabərliyi prinsiplərinə əsaslanan Azərbaycan Xalq Cümhuriyyəti bütün ölkə vətəndaşlarına eyni hüquqlar verərək irqi, milli, dini, sinfi bərabərsizliyi ortadan qaldırdı. Cümhuriyyət parlamentinin il yarımlıq fəaliyyəti boyunca qəbul etdiyi qanunlar milli dövlətin müstəqilliyinin möhkəmləndirilməsinə, siyasi və iqtisadi inkişafa, mədəniyyət və maarif sahələrində sürətli irəliləyişə imkan verdi. Azərbaycan Xalq Cümhuriyyəti daim sülhsevər siyasət apararaq bütün dövlətlərlə qarşılıqlı əməkdaşlıq əlaqələri yaratmağa və bir-birinin hüquqlarına hörmət prinsipləri əsasında münasibətlər qurmağa cəhd göstərirdi. Dünya birliyi tərəfindən tanınmış Xalq Cümhuriyyətinin fəaliyyəti sayəsində Azərbaycanın beynəlxalq hüququn subyekti olması 1920-ci ilin aprel ayındakı bolşevik işğalından sonra Azərbaycanın bir dövlət kimi dünyanın siyasi xəritəsindən silinməsinin qarşısını aldı.

Azərbaycan Xalq Cümhuriyyəti təcavüzə məruz qaldığı üçün qarşıya qoyduğu məqsədlərə tam müvəffəq ola bilmədən süquta uğrasa da, onun şüurlarda bərqərar etdiyi müstəqillik ideyası unudulmadı. Azərbaycan xalqı ötən dövr ərzində milli dövlətçilik atributlarının bir çoxunu qoruyub saxlaya bildi. Ümummilli lider Heydər Əliyevin respublikada uğurla gerçəkləşdirdiyi siyasət xalqımızın tarixi-mədəni yaddaşını özünə qaytararaq milli mənlik şüurunu inkişaf etdirdi, azərbaycançılıq məfkurəsi işığında müstəqillik arzularının güclənməsi və yaxın gələcəkdə yenidən həqiqətə çevrilməsinə zəmin yaratdı.

1991-ci ildə müstəqilliyinin bərpasına nail olarkən müasir Azərbaycan Respublikası özünün qədim dövlətçilik ənənələrinə sadiq qaldığını göstərdi, Xalq Cümhuriyyətinin siyasi və mənəvi varisi olmaqla onun üçrəngli bayrağını, gerbini, himnini qəbul etdi. Xalqımız Cümhuriyyətin istiqlalını dünyaya yaydığı 28 May gününü həmin vaxtdan Respublika Günü olaraq təntənə ilə qeyd edir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, milli dövlətçilik salnaməsini müstəsna dərəcədə zənginləşdirmiş Azərbaycan Xalq Cümhuriyyətinin 100 illiyinin layiqincə keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

*1. Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 illik yubileyi respublikada dövlət səviyyəsində geniş qeyd edilsin.*

*2. Azərbaycan Respublikasının Nazirlər Kabineti Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.*

*3. Azərbaycan Respublikasının Milli Məclisinə Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin yaranmasının 100 illik yubileyi münasibətilə xüsusi iclasın keçirilməsi tövsiyə edilsin.*

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 16 may 2017-ci il*

## "Dayanıqlı inkişaf və təhsil "mövzusunda seminar

**Mayın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 94-cü ilinə həsr edilən "Dayanıqlı inkişaf və təhsil" mövzusunda seminar keçirilib. Seminarda ADPU-nun rəhbərliyi, Rusiya Dayanıqlı və Qlobal İnkişaf İnstitutunun direktoru, Rusiya Təbiətşünaslıq Akademiyasının və Rusiya Ekologiya Akademiyasının həqiqi üzvü, professor Nizami Məmmədov, universitetin fakültə dekanları, kafedra müdirləri iştirak ediblər.**



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov seminarın çox aktual bir mövzuya həsr olunduğunu bildirib. Qeyd edib ki, seminarın keçirilməsində məqsəd bu sahədə qabaqcıl dünya təcrübəsinin öyrənilib tətbiq edilməsidir. Müasir dövrümüzdə ətraf mühitin və ekologiyanın mühafizəsi, bəşəriyyətin gələcəyi naminə təbii və intellektual resurslardan qənaətlə və səmərəli istifadə, insan və təbiət arasında inteqrasiya, əhalinin demoqrafiyası və ərzaqla təchizatı, davamlı inkişafda insan amilinin əsas götürülməsi, insanın həyat səviyyəsinin yüksəldilməsi, yaxşı təhsil, sosial ədalət, demokratiya, bəşəri sərmayənin, elm və texnologiyaların inkişafının davamlılığının təmin edilməsi, insan inkişafı indeksi, təhsilə sərmayə qoyulması böyük əhəmiyyət kəsb edir. Dayanıqlı inkişaf məhz bu vacib məqsədlərin həyata keçirilməsinə xidmət edir. Bu məqsədlərin həyata keçirilməsi isə sistemli, koordinasiya və inteqrasiya olunmuş fəaliyyət yolu ilə kompleks tədbirlərin gerçəkləşməsini vacib vəzifə kimi qarşıya qoyur. Hazırda dayanıqlı inkişaf dünya ictimaiyyətinin ən çox diqqət yetirdiyi məsələlərdən biridir. Bu prosesdə dövlət, qeyri-hökumət təşkilatlarının, ictimai birliklərin, kommersiya strukturlarının, eləcə də təhsil müəssisələrinin üzərinə böyük vəzifələr düşür. Rektor çıxışında belə seminarların daha geniş miqyasda keçirilməsinin vacibliyini vurğulayıb.

Seminarda Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov "Dayanıqlı inkişaf: qlobal və milli aspektlər"mövzusunda, Rusiya Dayanıqlı və Qlobal İnkişaf İnstitutunun direktoru, Rusiya Təbiətşünaslıq Akademiyasının və Rusiya Ekologiya Akademiyasının həqiqi üzvü, professor Nizami Məmmədov slayd vasitəsi ilə "Dayanıqlı inkişaf mədəniyyətinin formalaşdırılması dayanıqlı inkişafa keçid kimi" mövzusunda məruzələrlə çıxış ediblər. Qeyd edək ki, dayanıqlı inkişafın məzmun və mahiyyətini, məqsəd və hədəflərini, paradiqma və prioritetlərini, gender bərabərliyini, cəmiyyət və təhsilin vəhdətini, hamı üçün keyfiyyətli təhsil imkanlarının yaradılmasını, şəxsiyyətin təhsil vasitəsi ilə sosial mühitə uyğunlaşmasını, ömürboyu təhsili, dayanıqlı inkişaf sahəsində beynəlxalq əməkdaşlığı, bu sahədə beynəlxalq miqyasda qəbul edilən proqramların ölkələrin milli inkişaf proqramlarına daxil edilməsini və davamlı inkişafda yeni mədəniyyətin formalaşdırılmasını geniş əhatə edən hər iki məruzə böyük maraqla qarşılanıb.

Səmərəli və işgüzar keçən seminarda professor Əzizxan Tanrıverdi, professor İramin İsayev, dosent Razim Abdurazaqov, dosent Zahirəli Sadıxov və başqaları çıxış edərək maraqlı və dəyərli fikirlər səsləndiriblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbirə yekun vuraraq seminar iştirakçılarına fəaliyyətlərini davamlı inkişafın məqsəd və hədəflərinə uyğun qurmağı tövsiyə edib.

**Nigar Abbasova**

# Ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş elmi-praktik konfrans

*Mayın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) İbtidai təhsil fakültəsinin magistrantlarının xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 94 illiyinə həsr olunmuş elmi-praktik konfransı keçirilib.*

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bu günlər respublikamızda xalqımızın böyük oğlu Heydər Əliyevin anadan olmasının 94 illiyinə həsr olunan müxtəlif tədbirlər keçirilir. ADPU-da da bu münasibətlə tədbirlər keçirilir və bu tədbirlərin davamlı olması nəzərdə tutulur. Qeyd edib ki, ölkəmiz dəyişir, yeniləşir, müasirləşir və milli təhsil sistemimiz də buna uyğun olaraq yenilənir. ADPU-da keçirilən bugünkü konfrans da bu yeniliyin bir nümunəsidir. Elmə gedən böyük yolun məhz belə konfranslardan başladığını deyən rektor konfransın işinə uğurlar arzulayıb.



Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək bildirib ki, ulu öndər Heydər Əliyev xalqımızın öz milli varlığını təsdiq etməsində, müstəqil dövlətimizin qurulmasında və güclənməsində, ölkəmizin dünya miqyasında tanınmasında böyük xidmətlər göstərib. Ulu öndər Heydər Əliyev həmişə elm və təhsilə xüsusi diqqət və qayğı göstərib. Belə konfranslar universitetimizdə intellektual potensialın güclənməsinə səmərəli təsir göstərir.

İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Əzizxan Tanrıverdiyev, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva çıxış edərək konfransın keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. Onlar belə konfransların gənclərin elmi fəaliyyətə cəlb edilmələrinə müsbət təsir göstərdiyini vurğulayaraq konfransın işinə uğurlar arzulayıblar.

Konfransın plenar iclasında 5 məruzə dinlənilib. Plenar iclasa yekun vuran rektor Cəfər Cəfərov professor-müəllim heyətinə, elmi rəhbərlərə magistrantlarla daha çox işləməyi və onların elmi-tədqiqat işlərinə tələbkarlıqla yanaşmağı tövsiyə edib.

Plenar iclasdan sonra konfrans işini 3 bölmədə: İbtidai təhsilin pedaqogikası və metodikası, Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası, Azərbaycan dili və onun tədrisi metodikası bölmələrində davam etdirib. Konfransda ümumilikdə 94 məruzə dinlənilib. Məruzələrdə ibtidai təhsilin pedaqogikası və metodikası, Azərbaycan təhsilində kurikulum islahatı, ibtidai sinif müəlliminə verilən innovativ-pedaqoji tələblər, fəal-interaktiv dərsin mərhələləri, yeni pedaqoji texnologiyalara didaktik yanaşma, monitorinq və qiymətləndirmə anlayışının mahiyyəti və məzmunu, ibtidai məktəbin təlim prosesində inteqrasiyanın əhəmiyyəti, müəllim fəaliyyətinin diaqnostikası, təlim prosesində pedaqoji diaqnostikanın metodlarından istifadə imkanları və təhsilalanların diaqnostikası, təhsil prosesində informasiya-kommunikasiya texnologiyaları, şagird nailiyyətlərinin qiymətləndirilməsinin təlim-tərbiyə prosesində yeri, pedaqoji diaqnostikanın məqsəd və vəzifələri, keyfiyyətə nəzarətdə qiymətləndirmənin rolu, tələbələrin yaradıcılığında innovasiyaların rolu, müasir təhsildə milli-mənəvi dəyərlərin saxlanılması, qloballaşma şəraitində milli-mədəni ənənələr, tolerant düşüncə və digər vacib məqamlar əhatə olunub. Qeyd edək ki, konfransa təqdim edilən məqalələr və məruzələr "Ümummilli lider Heydər Əliyevin anadan olmasının 94 illiyinə həsr olunmuş ADPU-nun İbtidai təhsil fakültəsinin magistrantlarının elmi-praktik konfransının materialları" adı ilə kitab şəklində çap edilib.

Konfransın yekun iclasında bölmə sədrlərinin hesabatları dinlənilib, ən yaxşı məruzələrin müəllifləri I, II və III dərəcəli diplomlarla təltif ediliblər.

**Nurlan Səmədov**

# Ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr edilən tədbir



Mayın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının və Heydər Əliyev Muzeyinin birgə təşkilatçılığı ilə ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr edilən tədbir keçirilib. Tədbiri giriş sözü ilə açan Heydər Əliyev Muzeyinin direktoru Sahilə Nəcəfova bildirib ki, bugünkü tədbirin keçirilməsində məqsəd ulu öndər Heydər Əliyevin dövlətçilik fəlsəfəsinin, azərbaycançılıq ideologiyasının öyrənilməsi, geniş təbliğ olunması, tələbələri Heydər Əliyevin həyat və fəaliyyəti ilə daha yaxından tanış etməkdir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında bildirib ki, bu gün ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü tamam olur. Yubiley həm də hesabat deməkdir. Ölkəmizdə ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr edilən çoxsaylı tədbirlər keçirilir. ADPU-da da həm ümumuniversitet miqyasında, həm də fakültələrdə bu münasibətlə müxtəlif tədbirlər keçirilir. Dahi öndər Heydər Əliyevin şərəfli və mənalı həyat yolu, çoxşaxəli idarəçilik və dövlətçilik fəaliyyəti hər birimiz üçün layiqli nümunədir. Bizim üzərimizə böyük məsuliyyət və vəzifələr düşür. ADPU-nun ölkəmizin ali təhsil sistemində xüsusi yeri və mövqeyi var. ADPU respublikamızda pedaqoji kadr hazırlığının mərkəzi hesab edilir. Universitetimizin tələbə-gəncləri daim öz bilik və bacarıqlarını artırmalı, aparıcı xarici dilləri öyrənməli, ulu öndər Heydər Əliyevin yüksək ideallarına sadiq qalmalı, Onun həyat və fəaliyyətini, zəngin idarəçilik, dövlətçilik təcrübəsini dərindən öyrənməlidirlər.



ADPU-nun rektorunun müşaviri, professor Vilayət Əliyev çıxış edərək Heydər Əliyevin milli xilaskar, müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, dünya şöhrətli siyasi xadim, qüdrətli dövlət rəhbəri olduğunu bildirərək Ulu Öndərlə bağlı xatirələrini bölüşüb.

Tədbirdə Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova "Heydər Əliyev və müəllimlik peşəsi" mövzusunda məruzə ilə çıxış edib. Bildirib ki, Azərbaycana rəhbərlik etdiyi bütün dövrlərdə ümummilli lider Heydər Əliyev təhsilə, tərbiyəyə strateji sahə kimi baxmış, Vətənin, xalqın tərəqqisində onların roluna yüksək qiymət vermişdir. Bu gün ulu öndər Heydər Əliyevin siyasi kursunu Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev uğurla davam etdirir. Cəmiyyətimiz sürətlə inkişaf edir, təhsilin keyfiyyəti, inkişafı istiqamətində mühüm addımlar atılır. ADPU-da istər təhsil, istərsə də elmi-tədqiqat sahəsində aparılan böyük işlər bizə bunu deməyə əsas verir. Universitetimizdə təhsilin keyfiyyətini artırmaq məqsədilə pedaqoji kadr hazırlığına xüsusi diqqət yetirilir. Bütün bu islahatlar ADPU-nun rektoru, professor Cəfər Cəfərovun birbaşa rəhbərliyi ilə tam şəffaf və obyektiv şəkildə həyata keçirilir.

Tədbirdə "Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin banisidir" mövzusunda çıxış edən Azərbaycan tarixi kafedrasının professoru Xəqani Məmmədov qeyd edib ki, xalqımızın dövlət müstəqilliyinin maddi-mənəvi amilləri, milli şüur və milli özünüdərkin inkişaf etdirilməsi Ümummilli Liderimiz tərəfindən düşünülmüş şəkildə formalaşdırılmışdır. Özünün fitri istedadı, güclü idarəetmə qabiliyyəti ilə sübut etmişdir ki, Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin banisidir.

"Heydər Əliyev irsi və İslam həmrəyliyi" mövzusunda çıxış edən Tarix və coğrafiya fakültəsinin II tədris ilinin 201-ci qrup tələbəsi Aytac Təhməzli bildirib ki, müasir dövrümüzdə Azərbaycan dünyanın tolerantlıq mərkəzidir, dini konfessiyaların dinc yaşamasının unikal nümunəsidir. Bu gün Azərbaycan IV İslam Həmrəyliyi Oyunlarına yüksək səviyyədə ev sahibliyi edir və bununla İslam dünyasında vəhdətin, həmrəyliyin gücləndirilməsinə mühüm töhfələr verir.

# Fizika və texnologiya fakültəsində ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş tədbir

Mayın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, fakültənin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov,Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Pedaqoqlar" ilk ərazi partiya təşkilatının sədri, professor Himalay Qasımov, müəllimlər və tələbələr iştirak ediblər. Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə başlayan tədbirdə fakültənin tələbələri Ulu Öndərin həyat yolu ilə bağlı videoçarx nümayiş etdirib, dahi rəhbərə həsr olunmuş şeirlər oxuyub, rəqs kompozisiyası və mahnılar ifa ediblər. Maraqlı keçən tədbirdə Üzeyir Hacıbəyli adına Bakı Musiqi Akademiyası və Azərbaycan Milli Konservatoriyasının tələbələri də iştirak ediblər. Fakültə tələbələrinin çıxışları maraqla və alqışlarla qarşılanıb.





# Kimya və biologiya fakültəsinin ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş "Gənclər və elmi innovasiyalar" adlı elmi konfransı

Mayın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsi ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş "Gənclər və elmi innovasiyalar" adlı elmi konfrans keçirib. Konfransda ADPU-nun rəhbərliyi, fakültənin müəllim və tələbələri iştirak ediblər. Öncə konfrans iştirakçıları fakültənin professor-müəllim heyətinin elmi əsərlərindən və laborator təcrübələrindən ibarət sərgi ilə tanış olublar.

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bu gün xalqımızın həyatında əziz və əlamətdar bir gündür. Bu gün xalqımızın dahi oğlu, müstəqil dövlətimizin memarı və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü tamam olur. Ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü münasibətilə ölkəmizdə silsilə tədbirlər keçirilir. Bu münasibətlə ADPU-da da müxtəlif tədbirlər keçirilir. Rektor qeyd edib ki, müasir dünyamızın sürətli inkişafı bizim



qarşımıza yeni hədəflər, vəzifələr qoyur. Biz bu yeni hədəflərə çatmaq və qarşımıza qoyulan vəzifələrin uğurlu həllinə nail olmaq üçün əzmlə çalışmalı, bilik və bacarıqlara mükəmməl yiyələnməli, yüksək səviyyəli pedaqoji kadrlar hazırlamalıyıq. Rəqabət müasir dünyamızın inkişafını şərtləndirən əsas amillərdən biridir. Biz rəqabət mühitinə uyğunlaşmalı, gələcəyimizi təmin etməyi bacarmalıyıq. Rektor universitetin kollektivinin bu vacib vəzifələrin öhdəsindən layiqincə gələcəyinə inandığını ifadə edib.



Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək belə elmi konfransların tələbə-gənclərin elmə təşviq edilməsinə müsbət təsir göstərdiyini bildirib və konfrans iştirakçılarına uğurlar arzulayıb.

Kimya və biologiya fakültəsinin dekanı, dosent Elnarə Mehbalıyeva çıxış edərək fakültənin kollektivinə göstərdiyi diqqət və qayğıya görə ADPU-nun rektoru, professor Cəfər Cəfərova təşəkkür edib və universitet rəhbərliyinin fakültə qarşısında qoyduğu vəzifələrin layiqincə həyata keçirilməsi üçün əzmlə çalışacaqlarını bildirib.

Konfransda fakültənin fəaliyyətini, həyata keçirdiyi layihələri, ictimai-mədəni tədbirləri, həmçinin kollektivin uğurlarını əks etdirən slaydlar nümayiş etdirilib. Üzvi kimya və kimya texnologiyası kafedrasının müəllimi Səadət Abdullayeva çıxış edərək bildirib ki, fakültədə ödənişsiz ingilis dili və rus dili kursları təşkil edilib. Fakültədə hər ayın 1,2 və 3-də "Sağlam həyat günü" keçirilir. Tələbələrin sağlamlığını qorumaq məqsədilə "Sağlam həyat günü"nə Səhiyyə Nazirliyinin İnnovasion metodlar şöbəsindən, klinikalardan mütəxəssis-həkimlər dəvət olunur, onlar tələbələrlə sağlam həyat tərzi mövzusunda söhbətlər aparırlar. Həmçinin fakültədə bədii yaradıcılıq istedadı olan tələbələrin aşkar edilməsi üçün "Gənc şairlər" cəmiyyəti yaradılıb. Hər ayın sonu tələbələrimiz yazdıqları yeni şeirləri ilə çıxış edirlər. Tədbirlərə tanınmış şairlər dəvət olunurlar. Bunlarla yanaşı, fakültədə "İncəsənət saatı"na da start verilib. Hər həftənin 2-ci günü keçirilən "İncəsənət saatı"na rəqs etməyi, mahnı oxumağı, şəkil çəkməyi bacaran istedadlı tələbələr cəlb olunurlar.

Sonra fakültənin tələbələri slayd vasitəsi ilə "Eksperimentallar" layihəsinin təqdimatlarını ediblər. Konfransda fakültənin keçirdiyi olimpiadada I, II, III yerləri tutan tələbələrə diplomlar təqdim edilib. Sonda xatirə şəkli çəkdirilib.

# "Sonsuz dəhliz" filminin nümayişi



Mayın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) tələbələr üçün "Sonsuz dəhliz" filmi nümayiş etdirilib. Qeyd edək ki, "Sonsuz dəhliz" filmi Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla Əliyevanın təşəbbüsü ilə "Xocalıya ədalət!" beynəlxalq təbliğat kampaniyası çərçivəsində hazırlanmışdır. Bu film litvalı rejissor Andreas Brokasın Xocalı soyqırımından söz açan sənədli filmidir. Film litvalı jurnalist Riçard Lapaitisin Xocalıya səyahəti kimi təqdim olunur. Belə ki, 23 il əvvəl hərbi müxbir olan R.Lapaitis Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsini və Xocalı soyqırımını işıqlandırıb. O, Xocalıda kütləvi qətliamdan sağ çıxmış insanlarla görüşüb, ermənilərin atəşi altındakı "sonsuz dəhliz"də özünə nicat yolu axtararkən yaxınlarını itirən insanların ürəkdağlayan hekayələrini dinləyib. Filmin müəllifi Xocalı soyqırımının təşkilatçıları və icraçıları - erməni hərbi komandirləri ilə də söhbət edib. Onlar qəddar hücum strategiyalarından danışaraq, mülahizələrini bölüşüblər. Filmin süjeti real hadisələr, bu cəhənnəm əzabını yaşamış, kütləvi qırğını öz gözü ilə görmüş insanların xatirələri əsasında qurulub. O məşum gecədə bir çoxları erməni terrorçuları və cəlladları tərəfindən öldürülüb, bəziləri isə ermənilərin yaratdıqları müasir əsir düşərgələrinin ağır şəraitinə baxmayaraq, sağ qalıblar. Filmdə Xocalı soyqırımı yalnız Azərbaycan xalqına qarşı deyil, bütün bəşəriyyətə qarşı yönəldilmiş böyük cinayət kimi təsvir edilir. İngilis dilində çəkilmiş filmin subtitrləri Leyla Əliyevanın təşəbbüsü ilə çin, türk, fransız, italyan və alman dillərinə tərcümə olunub, həmçinin film rus dilinə dublyaj edilib. Çoxsaylı nüfuzlu beynəlxalq mükafatlara layiq görülən bu film dünyanın bir çox ölkələrində nümayiş etdirilib və Xocalı soyqırımının beynəlxalq miqyasda tanınmasında mühüm rol oynayıb. Real və təsirli "Sonsuz dəhliz" filmi tələbə-gənclərin marağına səbəb olub.

**Nurlan Səmədov**

# Tədris-yardımçı heyətin bilik və peşəkarlıq səviyyəsinin yoxlanılması başa çatdı



Xəbər verdiyimiz kimi, hazırda Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) kafedralarda tədris olunan fənlər üzrə professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün keçirilən müsabiqə ilə yanaşı, tədris-yardımçı heyətin də yoxlanılması keçirilir. Belə ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərovun müvafiq əmri ilə İnsan resursları şöbəsi tərəfindən aprelin 25-dən başlayaraq universitetdə tədris-yardımçı heyətin: tədris laboratoriya müdirlərinin, tyutorların, laborantların, baş laborantların, tədris ustalarının, operatorların və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının bilik və peşəkarlıq səviyyəsinin yoxlanılmasına başlanılıb. Məqsəd onların peşəkarlıq səviyyəsinin müəyyən edilməsi və təhsilin keyfiyyətinin yüksəldilməsidir. Yoxlamaya ümumilikdə 247 nəfər cəlb edilib. Yoxlama iki mərhələdə aparılıb. Birinci mərhələdə hər bir qrupu 14 nəfərdən ibarət olan tədris-yardımçı heyətin informasiya-kommunikasiya texnologiyaları (İKT) sahəsində bilik və bacarıqları yoxlanılıb. Yoxlamanın ikinci mərhələsi isə yazılı şəkildə aparılıb. Mayın 3-də keçirilən yazılı mərhələdə tədris-yardımçı heyətin ümumi elmi-nəzəri səviyyəsi, ixtisas bilikləri, eyni zamanda qanunvericiliklə bağlı bilikləri, məntiqləri, dünyagörüşləri respublikamızın tanınmış və nüfuzlu mütəxəssislərin iştirakı ilə yoxlanılıb. ADPU-nun rektoru, professor Cəfər Cəfərov yoxlama prosesinin gedişini izləyib. Qeyd edək ki, obyektiv və şəffaf keçirilən yoxlama prosesinin nəticələrindən asılı olaraq hər bir işçi barədə fərdi qaydada müvafiq qərar qəbul edilib.

**Könül Nəzərova**

# Ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş fərdi yaradıcılıq sərgisi



Mayın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Magistratura və doktorantura şöbəsinin "Təsviri incəsənət fənninin tədrisi metodikası və metodologiyası" ixtisasının II tədris ili magistrantı, Azərbaycan Rəssamlar İttifaqının üzvü Aygün İsmayıllının universitetdə ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunan fərdi yaradıcılıq sərgisi keçirilib. Sərgidə ADPU-nun rəhbərliyi, Azərbaycan Rəssamlar İttifaqının (ARİ) katibi, Xalq rəssamı, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) professoru Ağaəli İbrahimov, Mədəniyyət və Turizm Nazirliyinin (MTH) sektor müdiri, Azərbaycan Dövlət Rəsm Qalereyasının direktoru Qalib Qasımov, ARİ-nin Kitab qrafikası bölməsinin sədri, Azərbaycan Dövlət Rəssamlıq Akademiyasının (ADRA) müəllimi, Xalq rəssamı Arif Hüseynov, Əməkdar incəsənət xadimi, sənətşünaslıq üzrə fəlsəfə doktoru, ADRA-nın müəllimi Ziyadxan Əliyev, ARİ-nin Gənclər bölməsinin sədri Tahir Məmmədov, Əməkdar rəssam Elçin Aslanov, rəssam Nadejda İbrahimova iştirak ediblər. Qeyd edək ki, sərgidə Aygün İsmayıllının 25 rəsm əsəri nümayiş olunub.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov Aygün İsmayıllını təbrik edərək bildirib ki, bu gün universitetin həyatında əlamətdar bir gündür. ADPU-nun həm təhsildə, həm də yaradıcılıq sahəsində fərqlənən istedadlı tələbələri çoxdur. Azərbaycanın gələcəyini yüksək biliyə, istedada malik olan belə gənclər müəyyən edəcək. Biz belə tələbə-gənclərimizlə fəxr edir, qürur duyuruq. Aygün İsmayıllı gənc və istedadlı rəssamdır. Aygün İsmayıllı özünəməxsus yaradıcılıq üslubuna malikdir. Onun rəsm əsərləri məzmun və forma baxımından bir-birindən fərqlənir. Rektor çıxışının sonunda Aygün İsmayıllıya yeni yaradıcılıq uğurları arzulayıb.

ARİ-nin katibi, Xalq rəssamı, professor Ağaəli İbrahimov çıxış edərək sərginin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, ölkədə uğurla həyata keçirilən dövlət gənclər siyasətindən danışıb və Aygün İsmayıllıya uğurlar arzulayıb.

MTH-nin sektor müdiri Qalib Qasımov, Xalq rəssamı Arif Hüseynov, Əməkdar incəsənət xadimi Ziyadxan Əliyev çıxış edərək Aygün İsmayıllının sərgidə nümayiş olunan əsərlərini yüksək qiymətləndiriblər və rəssama müvəffəqiyyətlər arzulayıblar.

Sonda çıxış edən Aygün İsmayıllı fərdi yaradıcılıq sərgisinin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə, eləcə də bütün iştirakçılara təşəkkür edib.

**Nurlan İftixaroğlu**

# TGT-nin VII hesabat konfransı

Mayın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclət Təşkilatının (TGT) VII hesabat konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, Gənclər və idman nazirinin müavini İntiqam Babayev, AzərbaycanTələbə Gənclər Təşkilatları İttifaqının sədri (ATGTİ) Milli Məclisin deputatı Şahin İsmayılov, Gənclər və İdman Nazirliyinin şöbə müdiri Elşən Hüseynov, filial direktorları iştirak ediblər. Konfransda






ADPU-nu və onun filiallarını, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecini (ADPK) təmsil edən 234 nəfər tələbə iştirak edib. Konfransda əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib, sonra TGT-nin fəaliyyətini əks etdirən videoçarx nümayiş etdirilib.

Konfransı giriş sözü ilə açan aparıcı Aytac Fərzəliyeva hesabat məruzəsi ilə çıxış etmək üçün sözü TGT-nin sədri Cavid Hüseynova verib. C.Hüseynov təşkilatın 2015-2017-ci illər üzrə fəaliyyəti haqqında hesabat məruzəsi ilə çıxış edib. O, hesabat məruzəsində TGT-nin gördüyü işlər, həyata keçirdiyi çoxsaylı layihələr, ictimai-mədəni tədbirlər, humanitar aksiyalar, qazandığı uğurlar barədə ətraflı məlumat verib. Məruzəçinin çıxışında tələbə-gənclərin intellekt səviyyəsinin yüksəldilməsi, dünyagörüşlərinin genişləndirilməsi, onların vətənpərvər, adət-ənənələrimizə, milli-mənəvi dəyərlərimizə, dövlət və dövlətçiliyə sədaqət ruhunda tərbiyə olunmaları, həmçinin asudə vaxtlarının səmərəli təşkili üçün həyata keçirilən tədbirlər konkret faktlar və rəqəmlər əsasında öz əksini tapıb. C.Hüseynov təşkilata göstərdiyi xüsusi diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Gənclər və idman nazirinin müavini İntiqam Babayev çıxış edərək bildirib ki, ölkəmizdə həyata keçirilən dövlət gənclər siyasətinin əsası ulu öndər Heydər Əliyev tərəfindən qoyulub. Bu siyasətin məqsədi gənclərin yüksək səviyyədə təhsil almalarını təmin etmək, onların sosial fəallığını artırmaq və əsl vətəndaş kimi yetişdirməkdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin bu siyasəti uğurla davam etdirməsi gənclərin qarşısına yeni vəzifələr qoyur. Gənclər qazanılan uğurları daha da genişləndirməli, ölkəmizin inkişafına və dövlətimizin gücləndirilməsinə öz töhfələrini verməlidirlər. ADPU-nun TGT-si fəallığı ilə seçilir və öz üzərinə düşən vəzifələrin öhdəsindən layiqincə gəlir. İntiqam Babayev çıxışının sonunda TGT-yə uğurlar arzulayıb.

Konfransda çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bu gün universitetin həyatında əlamətdar bir gündür. Bugünkü konfansda TGT öz fəaliyyəti haqqında hesabat verməklə yanaşı, qarşıda duran vəzifələri də müəyyən edir. Azərbaycan öz dövlət müstəqilliyinin 26-cı ilini yaşayır. Müasir dünyamızda beynəlxalq siyasi vəziyyət çox çətin və mürəkkəbdir. Çağdaş dünyamızın tələblərinə uyğun olaraq Azərbaycan yeni inkişaf mərhələsinə qədəm qoyub. Qarşımızda yeni tələblər, hədəflər dayanır. ADPU böyük tarixə və şanlı ənənələrə malik olan bir ali təhsil müəssisəsidir. Pedaqoji Universitet olaraq bizim üzərimizə böyük vəzifələr düşür. Biz daim bilik və bacarıqlarımızı artırmalı, inkişaf etdirməli, öz fəaliyyətimizi müasir tələblərə uyğun qurmalıyıq. Rektor TGT-yə gələcək fəaliyyətində uğurlar arzulayıb.

ATGTİ-nin sədri, millət vəkili Şahin İsmayılov çıxış edərək TGT-nin ölkəmizin ictimai-mədəni həyatında fəal iştirak etdiyini, özünəməxsuz iş üslubu, kreativ düşüncə tərzi ilə fərqləndiyini bildirib və təşkilata uğurlar arzulayıb.

Konfransda təhsildə fərqlənən və universitetin ictimai həyatında fəal iştirak edən tələbələr təşəkkürnamə, fəxri fərman və diplomlarla təltif ediliblər. Eyni zamanda TGT-nin fəaliyyətinə dəstək verən fakültə dekanları, dekan müavinləri və tyutorlar təşəkkürnamə ilə təltif ediliblər.

ADPU rektorunun müşaviri, professor Vilayət Əliyev, Tərbiyə işləri üzrə prorektor, professor Fikrət Rzayev, Ümumi işlər üzrə prorektor Əbdül Xalıqov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Kimya və biologiya fakültəsinin dekanı, dosent Elnarə Mehbalıyeva, Fizika və texnologiya fakültəsinin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov, Gənclər və İdman Nazirliyinin şöbə müdiri Elşən Hüseynov, ADPU-nun Ağcabədi Filialının direktoru, dosent Mətanət Fərzəliyeva, Şamaxı Filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova çıxış edərək TGT-yə uğurlar arzulayıblar.

Konfransda TGT-nin sədri, sədr müavinləri, departament, klub və tədris korpuslarının rəhbərləri seçilib. Cavid Hüseynov yenidən TGT-nin sədri seçilib.

**Mahirə Məhərrəmqızı**

# ADPU ilə Səlcuq Universiteti arasında Anlaşma Memorandumu və Mövlana Mübadilə Proqramı Protokolu imzalanıb

Mayın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Türkiyə Respublikasının Səlcuq Universitetinin rektoru, professor Mustafa Şahin və həmin universitetin Ədəbiyyat fakültəsinin Tarix bölməsinin rəhbəri, professor Alaattin Aköz ilə görüşüb. Görüşdə ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Fəlsəfə və sosial fənlər kafedrasının baş müəllimi İradə Əliyeva iştirak ediblər.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov görüşdə rəhbərlik etdiyi ali təhsil müəssisəsinin yaranma tarixi, tədris prosesi, fəaliyyət istiqamətləri və beynəlxalq əlaqələri barədə məlumat verib. Bildirib ki, 1921-ci ildə yaranan ADPU ölkəmizdə ilk azərbaycandilli universitet olmuşdur. Azərbaycanın ali təhsil sistemində xüsusi yeri və mövqeyi olan ADPU yaxın gələcəkdə 100 illik yubileyini qeyd edəcəkdir. Son illər ölkəmizdə dövlət səviyyəsində müəllim hazırlığının səviyyəsinin yüksəldilməsi və cəmiyyətdə müəllim peşəsinin ictimai nüfuzunun artırılması üçün həyata keçirilən tədbirlərdən danışan rektor qeyd edib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 noyabr 2015-cil tarixli Sərəncamı ilə Azərbaycan Müəllim İnstitutu (AMİ) filialları ilə birlikdə ADPU-ya qoşulub. Hazırda ADPU-nun 5 filialı var. ADPU-da 8 fakültə, 39 kafedra fəaliyyət göstərir. Universitetdə 20 minə yaxın tələbə təhsil alır. Tədris 4 korpusda aparılır. Nazirlər Kabinetinin müvafiq qərarı ilə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə birləşdirməklə ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərir. 2016-2017-ci tədris ilindən Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb ADPU-nun baza məktəbi kimi müəyyənləşib. Hazırda ADPU-da alternativ əsaslarla bir neçə mərhələdən ibarət olmaqla, professor-müəllim heyətinin müsabiqəsi keçirilir. Müsabiqənin keçirilməsində məqsəd ADPU-da tədris prosesinin təkmilləşdirilməsi, yüksək elmi biliyə malik mütəxəssisləri işə cəlb etməkdir. Eyni zamanda tədris-yardımçı heyətin bilik və peşəkarlıq səviyyəsinin müəyyən edilməsi üçün yoxlama keçirilib, hazırda isə onların attestasiyası aparılır.

Rektor Cəfər Cəfərov qeyd edib ki, Azərbaycan Prezidenti İlham Əliyevin müvafiq sərəncamı ilə bu il ölkəmizdə "İslam Həmrəyliyi İli" elan edilib. Hazırda Azərbaycanda IV İslam Həmrəyliyi Oyunları keçirilir. Bu oyunlar islam ölkələrinin həmrəyliyinin güclənməsinə böyük töhfələr verəcək.

Səlcuq Universitetinin rektoru, professor Mustafa Şahin səmimi və mehriban münasibətə görə ADPU-nun rektoruna təşəkkür edərək universitet barədə məlumat verib. Bildirib ki, Səlcuq Universiteti 1975-ci ildən fəaliyyət göstərir. 23 fakültəsi, 95 min tələbəsi var. Türkiyənin ən böyük universitetlərindən biri olan Səlcuq Universitetinin hər il 22 min məzunu olur, bu məzunlar dövlət və özəl sektorda uğurla çalışırlar. Universitet Səlcuq dövlətinin mədəni mirasını yaşadır.

Görüşdə ADPU ilə Səlcuq Universiteti arasında Anlaşma Memorandumu və Mövlana Mübadilə Proqramı Protokolu imzalanıb. Qeyd edək ki, Anlaşma Memorandumunda universtetlər arasında təqdiqat və təhsil məqsədilə qısamüddətli müəllim (dərs vermə, mühazirə) və tələbə mübadiləsi, əsas elmi araşdırmalar sahəsində tələbə və alimlərin mübadiləsi, konfrans və simpoziumalara akademik heyətin dəvət olunması, informasiya, araşdırma və nəşr materiallarının mübadiləsi, videokonfrans əlaqələrinin inkişafı və digər vacib məqamlar nəzərdə tutulub. Mövlana Mübadilə Proqramı Protokolunda isə iki universitet arasında 2022-ci ilə qədər tələbə-müəllim mübadiləsinin həyata keçirilməsi nəzərdə tutulmuşdur.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Səlcuq Universitetinin rektoru, professor Mustafa Şahin iki ali təhsil müəssisəsi arasında Anlaşma Memorandumunun və Mövlana protokolunun imzalanmasından məmnun qaldıqlarını bildirərək, bu əməkdaşlığın hər iki tərəf üçün faydalı olacağına inamlarını ifadə ediblər. Görüşdə rektorlar təmsil etdikləri universitetlərlə bağlı hədiyyələri təqdim ediblər. Sonra rektor Cəfər Cəfərov professor Mustafa Şahini universitetin binası, Heydər Əliyev Muzeyi, Heydər Əliyev məktəbinin lektoriyası, tədris auditoriyaları, kitabxanası, oxu, idman və akt zalları ilə tanış edib. Sonda xatirə şəkilləri çəkdirilib.

# ADPU-nun nəzdində ADPK-də ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş "Azərbaycan səmasının sönməz nuru" adlı tədbir

Mayın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş "Azərbaycan səmasının sönməz nuru" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, ADPK-nin müəllim və tələbə kollektivi iştirak edib.



Əvvəlcə tədbir iştirakçıları Ulu Öndərin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş rəsm sərgisi ilə tanış olublar.

Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə başlayan tədbirdə çıxış edən ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov ümummilli lider Heydər Əliyevin Vətən və xalq qarşısındakı misilsiz tarixi xidmətlərindən danışıb. Bildirib ki, Ümummilli Lideri mənsub olduğu xalqa bəxş edən günün özü də ümummilli önəm daşıyır. Milli dövlətçiliyin inkişafını və qüdrətlənməsini təmin edən tarixi şəxsiyyətin həyatı və fəaliyyəti bu tarixin özü ilə eyniləşir, bu dövrün başlıca mahiyyətini təşkil edir. Qeyd edib ki, Heydər Əliyev çağdaş Azərbaycanın tarixinin yönünü və məzmununu müəyyən etməklə zamanın fövqünə yüksəlib, əbədiyyət qazanmış tarixi şəxsiyyətdir. "Ümummilli lider Heydər Əliyevin Azərbaycan tarixindəki yeri nə qədər müstəsna və önəmlidirsə, onun dünyaya göz açdığı gün də Azərbaycan xalqı üçün bir o qədər dəyərli və əlamətdardır" deyən Q.Novruzov gənclərimizə Heydər Əliyevin həyat yolunun örnək olduğunu vurğulayıb.

Sonra ADPU-nun rektoru, professor Cəfər Cəfərov Ulu Öndərin idarəçilik və dövlətçilik fəaliyyətindən danışaraq gənclərimizə Onun fəaliyyətindən nümunələr gətirərək tövsiyələrini verib.

Çıxışlardan sonra ADPK-nin tələbələri Ulu Öndərin anadan olmasının 94-cü ildönümünə həsr etdikləri kompozisiyanı təqdim ediblər. Kompozisiya müəllimlər və tələbələr tərəfindən maraqla qarşılanıb.

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində fakültə magistrantlarının ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş elmi konfransı



Mayın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində fakültə magistrantlarının ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş elmi konfransı keçirildi. Konfransda ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Asəf Zamanov iştirak edirdi. Fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva qonaqları və iştirakçıları salamladıqdan sonra söz professor A.Zamanova verildi. Professor A.Zamanov gənclərə ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətini dərindən öyrənməyi tövsiyə etdi.

Elmi konfransda ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətindən bəhs edən videoçarx nümayiş etdirildikdən sonra məruzələrin dinlənilməsinə başlandı. Plenar iclasda magistrantlar İlahə Paşayevanın və Günel Qurbanovanın məruzələri dinlənildi.

Çıxışlardan sonra bölmələr üzrə iclaslar keçirildi. 3 bölmə üzrə: "Məktəbəqədər təlim və tərbiyə", "Təhsildə sosial-psixoloji xidmət" və "Korreksiyaedici təlim" ixtisasları üzrə məruzələr dinlənildi.

Konfransın bölmələr üzrə iclaslarına sədrlik edən professor Müseyib İlyasov, professor Ramiz Əliyev və dosent Nailə Hüseynova sonda məruzələri I,II və III yerlərə layiq görülən magistrantların fərqləndirilməsi üçün təqdimatlar hazırladılar. İştirakçılara məruzələrin mətni çap olunmuş konfrans materialları təqdim edildi. Konfransda "Psixoloq" qəzetininin baş redaktoru Tahir Heydərov da iştirak edirdi.

**Günel Qurbanova, magistrant**

# Elmi Şuranın iclası

Mayın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. Elmi Şuranın iclasını giriş sözü ilə açan ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov bildirib ki, iclasın gündəliyinə 2014-cü ildə təsdiq edilmiş tədris planlarına uyğun pedaqoji təcrübənin təşkili, ADPU-nun Quba Filialının fəaliyyəti haqqında, Riyaziyyat və informatika fakültəsinin fəaliyyəti haqqında və cari məsələlər daxildir. Iclasın əvvəlində Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı (ATİAHİ) Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Asəf Zamanova səmərəli elmi-pedaqoji fəaliyyəti və anadan olmasının 60 illiyi ilə əlaqədar ATİAHİ-nin Fəxri Fərmanını təqdim edib, həyatda və elmi-pedaqoji fəaliyyətində uğurlar arzulayıb. Professor Asəf Zamanov göstərilən qayğı və diqqətə görə ATİAHİ-nin rəhbərliyinə təşəkkür edib.



Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev "2014-cü ildə təsdiq edilmiş tədris planlarına uyğun pedaqoji təcrübənin təşkili haqqında" çıxış edib. Dosent Sənan Əliyev bildirib ki, Nazirlər Kabinetinin 2008-ci il 19 sentyabr tarixli 221 nömrəli qərarı ilə təsdiq edilmiş "Ali (orta ixtisas) təhsil müəssisələri tələbələrinin ixtisas üzrə təcrübəsinin keçirilməsi haqqında Əsasnamə" yə əsasən pedaqoji təcrübəyə bir tələbə üçün ümumilikdə 56 saat vaxt ayrılır. Təhsil müəssisəsi üzrə pedaqogika üzrə rəhbərə 4 saat, psixologiya üzrə rəhbərə 2 saat, ixtisas metodistinə 31 saat ayrılır. Təcrübə keçirilən ümumi təhsil məktəbi üzrə məktəbin direktoruna və ya tədris işləri üzrə direktor müavininə 2 saat, fənn müəlliminə 16 saat, sinif rəhbərinə isə 1 saat ayrılır. Qeyd edib ki, 2014-cü ildə təsdiq edilmiş təhsil proqramlarına əsasən pedaqoji təcrübənin müddəti 14 həftə müəyyən edilib və əyani təhsil forması üzrə IV tədris ilinin yaz semestri ərzində keçirilməsi nəzərdə tutulub. Qiyabi təhsil forması üzrə pedaqoji təcrübənin müddəti 10 həftə müddətinə və X semestrdə nəzərdə tutulub. 14 həftəlik təcrübə müddətinin 10 həftəsi məktəb üçün, 4 həftəsi isə çöl təcrübəsi üçün nəzərdə tutulub. Bu zaman məktəbdə metodistə 25 saat, fənn müəllimınə 13 saat ayrılması nəzərdə tutulur. Qalan 8 saat çöl təcrübəsində iqtisadi coğrafiya və fiziki coğrafiya üzrə müəllimlər üçün nəzərdə tutulur. Qiyabi təhsil formasında isə 10 həftəlik təcrübənin 8 həftəsi məktəbə, 2 həftəsi isə çöl təcrübəsinə ayrılır. Bu zaman məktəbdə metodist üçün16 saat, fənn müəllimi üçün 6 saat nəzərdə tutulur. Qalan 6 saat çöl təcrübəsində iqtisadi coğrafiya və fiziki coğrafiya üzrə müəllimlər üçün nəzərdə tutulur. Hər bir tələbənin qiyməti pedaqoji təcrübə müddətində görülmüş işlərin və müvafiq sənədlərin lazımi səviyyədə yerinə yetirilməsi əsasında verilir. Pedaqoji təcrübə 100 ballıq sistemlə qiymətləndirilir. Tələbənin hər iki müəssisədə təcrübə keçməsi zəruridir. Belə ki, iki müəssisədən birində təcrübədə iştirak etməyən tələbə pedaqoji təcrübəni keçməmiş hesab olunur. Müxtəlif ixtisaslar üzrə tələbələrin pedaqoji təcrübələrinin qiymətləndirilmə meyarları uyğun kafedralar tərəfindən müəyyənləşdirilir. Əgər tələbənin pedaqoji təcrübə ilə yanaşı, digər təcrübə keçməsi nəzərdə tutulursa, onun hər iki təcrübənin keçməsi zəruridir. İki təcrübədən birində iştirak etməyən tələbənin pedaqoji təcrübədə fəaliyyəti qiymətləndirilmir. Kafedraların qərarları fakültə Elmi Şurası tərəfindən təsdiq edilir və tələbələrə, həmçinin təcrübəyə rəhbərlik edən müəllimlərə təcrübədən öncə çatdırılır.

Elmi Şura dosent Sənan Əliyevin hesabatını qəbul edib.

"ADPU-nun Quba Filialının fəaliyyəti haqqında" filialın direktoru, professor Əli Allahverdiyev çıxış edib. Professor Ə. Allahverdiyev bildirib ki, ADPU-nun Quba Filialı bölgənin mədəni inkişafında böyük rol oynayan ali təhsil müəssisəsidir. Filial 26 illik fəaliyyəti dövründə zəruri ehtiyac olan ixtisaslar üzrə 2 mindən çox kadr hazırlamış, qaneedici elmi-pedaqoji kadr potensialı formalaşdırmışdır. Tədris auditoriyalarında dərslər müasir təhsilin tələblərinə uyğun şəkildə qurulur. Hazırda filialda 6 ixtisas üzrə 775 nəfər tələbə təhsil alır. Onlardan 4 nəfəri Təhsil Nazirliyinin təsis etdiyi "Gələcəyin müəllimi təqaüdü"nə layiq görülüb. Son 3 ildə filialın ixtisaslarına müsabiqə xeyli yüksəlib, keçid ballarında dinamik artım var. Filialda professor-müəllim heyətinin tərkibində 46 nəfər çalışır ki, onlardan 3 nəfəri elmlər doktoru, o cümlədən 2 nəfəri professor, 15 nəfəri fəlsəfə doktoru, o cümlədən 5 nəfəri dosent, 14 nəfəri baş müəllim, 4 nəfəri magistr, 10 nəfəri doktorant və dissertantdır. Professor-müəllim heyətinin elmi-tədqiqat işlərinə cəlb edilməsi sahəsində uğurlu nəticələr əldə edilib. 2016-cı ildə filial əməkdaşları tərəfindən tədris prosesi üçün zəruri ehtiyac olan 1 dərslik, 1 proqram , 13 elmi və elmi-metodiki məqalə, 7 konfrans tezisi hazırlanaraq nəşr etdirilib. Professor-müəllim heyəti, əməkdaşları, gənc tədqiqatçıları və tələbələri respublika və beynəlxalq səviyyəli elmi konfranslarda, müxtəlif layihələrdə fəal iştirak edirlər. Filialda ali təhsilin bakalavriat səviyyəsində pedaqoji kadr hazırlığı ilə yanaşı, pedaqoji kadrların ixtisasının artırılması, təkmilləşdirilməsi və yenidənhazırlanması sahəsində də səmərəli işlər aparılıb. Filialda Elmi Şura, Tələbə Gənclər Təşkilatı, Tələbə Elmi Cəmiyyəti və Tələbə Həmkarlar Təşkilatı fəaliyyət göstərir. Tələbə-gənclərin asudə vaxtlarının səmərəli təşkili məqsədilə müntəzəm olaraq müxtəlif mövzularda elmi konfranslar, disput və debatlar, yubiley və müsabiqələr, yarışlar keçirilir, müxtəlif kurslar təşkil olunur. Filialın tələbələri bölgənin ictimai həyatında, mədəni-kütləvi tədbirlərində yaxından iştirak edir, cəmiyyətə yararlı şəxsiyyət kimi inkişaf edirlər.

Elmi Şura professor Ə.Allahverdiyevin hesabatını qəbul edib.

"Riyaziyyat və informatika fakültəsinin fəaliyyəti haqqında" fakültənin dekanı, dosent Maqsud Nəcəfov çıxış edib. Qeyd edib ki, fakültədə 4 kafedra: Riyazi analiz, Cəbr və həndəsə, Riyaziyyat və onun tədrisi metodikası, Hesablama riyaziyyatı və informatika kafedraları fəaliyyət göstərir. Fakültədə 9 professor, 32 dosent, 22 baş müəllim, 14 müəllim çalışır. Fakültədə fəaliyyət göstərən elmi-metodiki seminarda yalnız fakültənin deyil, respublikanın digər ali məktəblərinin əməkdaşları da öz elmi araşdırmalarının nəticələri barədə məlumatlar verirlər. Fakültədə əsasən funksiyalar nəzəriyyəsi, funksional analiz, diferensial və inteqral tənliklər nəzəriyyəsi, diferensial və inteqral tənliklərin ədədi həlləri, riyaziyyatın tədrisi metodikası, cəbr və həndəsənin bəzi aktual məsələləri ilə bağlı elmi araşdırmalar aparılır. Fakültədə azərbaycan və rus bölmələri fəaliyyət göstərir. Ali təhsilin bakalavriat səviyyəsində 3 ixtisas, magistratura səviyyəsində isə 2 ixtisas üzrə kadr hazırlığı həyata keçirilir. Bakalavriat səviyyəsində 1355 nəfər tələbə təhsil alır. Onlardan 1267 nəfər əyani şöbədə, 88 nəfər qiyabi şöbədə təhsil alır. Magistratura səviyyəsində 100 nəfər təhsil alır. Bakalavriat səviyyəsində "Riyaziyyat müəllimliyi", "Riyaziyyat-informatika müəllimliyi", "İnformatika müəllimliyi" ixtisasları üzrə, Magistratura səviyyəsində isə "Riyaziyyatın tədrisi metodikası və metodologiyası", "İnformatikanın tədrisi metodikası və metodologiyası" ixtisasları üzrə mütəxəssis hazırlanır. Fakültədə və kafedralarda ayda bir dəfə elmi-innovativ seminarlar keçirilir. Hər il ulu öndər Heydər Əliyevin doğum günü ilə əlaqədar olaraq TEC-in konfransları keçirilir. Fakültədə "Ustad dərsləri", "Açıq qapı günləri" layihələri çərçivəsində müxtəlif tədbirlər, həmçinin "Hesablama riyaziyyatı və informatika kafedrasının tarixi haqqında" kitabın təqdimatı keçirilib. Tələbələr pedaqoji təcrübələrini Bakı şəhərinin müasir tələblərə cavab verən, yüksək kadr potensialı ilə seçilən qabaqcıl orta ümumtəhsil məktəblərində keçirlər. Tələbələrimiz IV İslam Həmrəyliyi Oyunlarında könüllü olaraq iştirak ediblər. Fakültədə Elmi Şura, Tələbə Gənclər Təşkilatı, Tələbə Həmkarlar Təşkilatı və Tələbə Elmi Cəmiyyəti fəaliyyət göstərir.

Elmi Şura dosent Maqsud Nəcəfovun hesabatını qəbul edib.

Rektor Cəfər Cəfərov ADPU-nun üzv olduğu Avropa Müəllim Hazırlığı Şəbəkəsinin (ETEN) xətti ilə İsveçdə iştirak etdiyi beynəlxalq tədbir barədə, Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov isə Ufa şəhərində Rusiya və Azərbaycan ali təhsil müəssisələri Assosiasiyasının II Forumunda iştirak etməsi, həmçinin Başqırdıstan Dövlət Pedaqoji Universiteti ilə ADPU arasında elm, təhsil və mədəniyyət sahəsində əməkdaşlığa dair müqavilə imzalanması barədə Elmi Şura üzvlərini məlumatlandırıblar. İclasda fakültə dekanlarının və kafedra müdirlərinin müsabiqəsinin keçirilməsi üçün yaradılan komissiyanın tərkibi də təsdiq edilib.

Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov cari məsələlər barədə məlumat verib. Cari məsələlər müzakirə edilib və müvafiq qərarlar qəbul olunub.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov iclasa yekun vuraraq səslənən fikirlərin, qəbul edilən qərarların, qarşıya qoyulan vəzifələrin həyata keçirilməsi üçün Elmi Şura üzvlərinə öz tapşırıq və tövsiyələrini verib.

**Mənsur İbrahimli**

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsində ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr edilən konsert





Mayın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsi ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr edilən konsert keçirib. Konsertdən öncə iştirakçılar fakültənin müəllim və tələbələrinin rəsm əsərləri ilə tanış olublar.

Tədbiri giriş sözü ilə açan Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova ADPU rəhbərliyinin diqqət və qayğısı ilə fakültədə tədris prosesinin təkmilləşdirilməsi ilə yanaşı, həyata keçirilən müxtəlif ictimai-mədəni tədbirlər, layihələr haqqında məlumat verib. Bildirib ki, fakültənin keçirdiyi "Bizi tanıyın!"layihəsi çərçivəsində müəllim və tələbələr ümumi təhsil müəssisələrində maraqlı və rəngarəng konsert proqramları ilə çıxış ediblər , eyni zamanda respublika miqyasında keçirilən tədbirlərdə fəal iştirak ediblər. Bunlarla yanaşı, fakültənin idmançı və hərbçi müəllim və tələbələri ADPU-nu müxtəlif tədbirlərdə layiqincə təmsil ediblər.

Tədbirdə ulu öndər Heydər Əliyevin həyat və fəaliyyəti ilə bağlı slayd nümayiş etdirilib. Həmçinin fakültədə universitet rəhbərliyinin iştirakı ilə keçirilən ictimai-mədəni tədbirləri, eləcə də fakültənin fəaliyyətini əks etdirən slayd göstərilib.

Konsertdə Nərmin Kamilovanın dirijorluğu ilə fakültənin birləşmiş xoru çıxış edib, sonra musiqisi Nailə Mirməmmədlinin, sözləri Asəf Həsənovun olan fakültənin himni ilk dəfə səsləndirilib. Konsertdə həmçinin musiqisi Nailə Mirməmmədlinin, sözləri Nərmin Kamilovanın olan "Ulu Öndər", musiqisi Kamalın, sözləri Baba Vəziroğlunun olan "Xalq Heydər söyləyəcək", musiqisi Nailə Mirməmmədlinin, sözləri Baba Vəziroğlunun olan "İnşallah" mahnıları səsləndirilib. Daha sonra II tədris ilinin tələbəsi Məhərrəməli Əlişanov Elmira Həsənovanın müşayiəti ilə Sevil Əliyevanın "Ana", II tədris ilinin tələbəsi Nərgiz Əliyeva Tofiq Quliyevin "Prelyüd", IV tədris ilinin tələbəsi Hikmət Mustafazadə Emin Sabitoğlunun "Şükriyyə" mahnılarını, fakültənin açıqlar ansamblı "Azərbaycan" mahnısını, IV tədris ilinin tələbəsi, beynəlxalq müsabiqə laureatı Lalə Ağayeva Qara Qarayevin "Yeddi Gözəl" baletindən vals, Aslan Əzimzadə isə Müslüm Maqomayevin "Azərbaycan" mahnısını ifa ediblər. Qeyd edək ki, konsert universitet kollektivinin böyük marağına səbəb olub.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək konsertin yüksək səviyyədə keçirilməsinə görə fakültənin kollektivinə təşəkkür edib və uğurlar arzulayıb.

# TEC-in ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş 74-cü elmi konfransı



Mayın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Elmi Cəmiyyətinin (TEC) ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş 74-cü elmi konfransı keçirilib. Konfransda əvvəlcə Azərbaycanın Dövlət Himni və "Koroğlu" uvertürası səslənib.

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov TEC-in 74-cü elmi konfransının keçirilməsini müsbət hal kimi qiymətləndirib. Qeyd edib ki, tələbələrin böyük elmə gedən yolu TEC-dən başlayır. Biz tələbələrin elmi fəaliyyətə təşviq edilməsi üçün lazımi tədbirləri həyata keçirməli, elmi-tədqiqat işləri aparmalarına diqqət və qayğı göstərməli, onların elmi-tədqiqat işlərinin müasir tələblərə uyğun olmasını təmin etməliyik. Rektor tələbələrə xalqımızın tarixini, mədəniyyətini, ədəbiyyatını, incəsənətini, adət-ənənələrini, milli-mənəvi dəyərlərini, mədəni irsini mükəmməl öyrənməyi, bilik və bacarıqlara dərindən yiyələnməyi tövsiyə edib və konfrans iştirakçılarına uğurlar arzulayıb.



Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxışında universitetdə dövri elmi nəşrlərin artması, gənclərin apardıqları elmi-tədqiqat işləri, fənlər üzrə olimpiadaların keçirilməsi, bu olimpiadaların həm elmi, həm yaradıcı istiqamətdə aparılması barədə məlumat verib və olimpiadaların bütün fakültələr üzrə keçirilməsinin vacibliyini qeyd edib. TEC-in fəaliyyətinin daha səmərəli qurulmasının universitetdə tələbələrin elmi fəaliyyətlərinə müsbət təsir edəcəyini bildirib. Professor A.Zamanov ADPU-nun rektoru, professor Cəfər Cəfərovun rəhbərliyi ilə həm kafedralarda tədris olunan fənlər üzrə vakant professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün keçirilən müsabiqənin, həm də tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının attestasiyasının yüksək səviyyədə, şəffaf və obyektiv keçirildiyini vurğulayıb və konfransın işinə uğurlar arzulayıb.

TEC-in sədri, dosent Əli Zalov çıxış edərək TEC-in böyük və zəngin tarixə malik olduğunu bildirib. Qeyd edib ki, TEC-in məqsədi tələbələrin bilik və bacarıqlarını aşkar etmək, onları elmi-tədqiqat işinə yönəltmək, tələbələrdə faktları araşdırmaq, təhlil etmək, müqayisə aparmaq bacarıqlarını formalaşdırmaqdır. Bu baxımdan TEC-in 74-cü elmi konfransı mühüm əhəmiyyət kəsb edir.

Plenar iclasda tələbələr slayd vasitəsi ilə məruzələrini təqdim ediblər.

Sonra konfrans öz işini 7 bölmədə-Riyaziyyat, Fizika və texnologiya, Kimya və biologiya, Tarix və coğrafiya, Filologiya, Pedaqogika və psixologiya, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq bölmələrində davam etdirib. Bütövlükdə bölmələrdə 181 məruzə dinlənilib. Konfransın sonunda bölmə sədrlərinin hesabatları dinlənilib, müvafiq qərarlar qəbul edilib.

# ADPU-nun Şamaxı Filialında III Beynəlxalq Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumu

Bir çox tədbirlərə uğurla ev sahibliyi etmiş Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialının tarixinə daha bir əlamətdar simpoziumun keçirilməsi yazıldı. 17-18 may 2017-ci ildə ADPU və onun Şamaxı Filialının, Türkiyə Cumhuriyyəti Amasiya Universitetinin, Amasiya Azərbaycan Türkləri Kültür Sanat və Dayanışma Dərnəyinin və Miras Mədəni İrsin Öyrənilməsinə Kömək İctimai Birliyinin birgə təşkil etdiyi III Beynəlxalq Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumunun ADPU-nun Şamaxı Filialında keçirilməsi çox yaddaqalan bir hadisədir. Tədbirdə Türkiyənin Amasiya Universiteti, Marmara Universiteti, Necmettin Ərbakan Universiteti, Çankırı Karatekin Universiteti, İtaliya Yokoku Assosiasiyası, Makedoniyadan 25 nəfər olmaqla, respublikamızın tanınmış alimlərindən akademik İsa Həbibbəyli, akademik Muxtar İmanov, akademik Teymur Kərimli, ADPU-nun rektoru, professor Cəfər Cəfərov və universitetin Ağcabədi, Quba, Cəlilabad, Şəki filiallarının direktorları, Şamaxı Rayon İcra Hakimiyyəti (RİH) başçısının birinci müavini Qasım Qasımov, Azərbaycanın bir çox elm müəssisələrindən və mədəniyyət mərkəzlərindən olan 120 nəfər elm xadimi, həmçinin Seyid Həmzə Nigarinin nəslindən olan qonaqlar, media nümayəndələri, Şamaxı Filialının professor-müəllim və tələbə heyəti iştirak edirdilər.

Simpozium iştirakçıları əvvəlcə Şamaxı rayon mərkəzində yerləşən ulu öndər Heydər Əliyevin abidəsini ziyarət etdilər, abidənin önünə gül dəstələri qoydular və Heydər Əliyev Mərkəzini ziyarət etdilər.

Simpozium iştirakçılarının qeydiyyat prosesi başa çatdıqdan sonra filialın akt zalında plenar iclas başladı. Simpoziumu giriş sözü ilə filialın direktoru, filologiya üzrə fəlsəfə doktoru, dosent Tünzalə Yusifova açaraq iştirakçıları salamladı və bildirdi ki, bu gün eyni zamanda işığına toplaşdığımız




Həmzə Nigarinin doğulduğu Qarabağın dilbər guşələrindən biri olan Laçın rayonunun erməni qəsbkarları tərəfindən işğal edildiyi gündür. Hələ 200 il öncə Nigari Qarabağın ruslar tərəfindən işğalından sonra yazdığı şeirində bu faciəli hadisənin "sinəsinə sancılan xəncər kimi onu istiraba qərq etdiyini" ifadə etmişdir. Sanki o, Qarabağın 200 il sonra ermənilər tərəfindən işğal edilib talan olunacağını hiss etmiş kimi bugünkü insanların əhvali-ruhiyyəsini misralarında əks etdirmişdir. Qarabağ həsrəti ilə alışıb yanan Həmzə Nigari bu günümüz üçün də dua etmişdir.

Sonra Laçın rayonunda və bütövlükdə Azərbaycanın dövlət müstəqilliyi, ərazi bütövlüyü uğrunda şəhid olan soydaşlarımızın xatirəsi bir dəqiqəlik sükutla yad edildi, Türkiyə və Azərbaycanın dövlət himnləri səsləndirildi.

T.Yusifova çıxışında qeyd etdi ki, qədim elm və mədəniyyət mərkəzi olan Şamaxıda Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumunun keçirilməsi əlamətdar hadisə olmaqla yanaşı, həm də məntiqidir. ADPU-nun Şamaxı Filialının tarixində ilk dəfə belə bir beynəlxalq simpoziumun keçirilməsi xüsusilə əhəmiyyətlidir və gələcəkdə belə tədbirlərin keçirilməsi üçün uğurlu başlanğıcdır.

Giriş sözündən sonra Həmzə Nigarinin "Nə sünniyiz, nə şiyə" misraları musiqinin müşayiəti ilə səsləndirildi.

Sonra qonaqları salamlamaq üçün söz simpoziumun keçirilməsi üçün ilk günlərdən böyük dəstək olmuş, xüsusi diqqət və qayğı göstərmiş ADPU-nun rektoru, professor Cəfər Cəfərova verildi. Rektor Cəfər Cəfərov simpozium iştirakçılarını salamlayaraq İslam Həmrəyliyi İlində Şamaxıda-filialımızda dünyaca tanınmış məşhur sufi şairi Həmzə Nigarinin adı ilə bağlı III Beynəlxalq Simpoziumun keçirilməsinin mühüm hadisə olduğunu qeyd etdi və bütün iştirakçılara uğurlar arzuladı. Rektor Həmzə Nigarinin Türk-İslam dünyasına mənə yüklü əsərlər bəxş etməsindən danışaraq bildirdi ki, onun divanı türk dilində əvvəlcə Tiflisdə, sonra İstanbulda nəşr edilmişdir. Sonralar isə dəyərli alimlərin əsərlərinin sadələşdirməsi və yeni əlifbaya çevirməsi ilə həm Türkiyədə, həm də Azərbaycanda yenidən çap olunmuşdur. Həmzə Nigarinin İstanbulda nəşr olunan fars dilində də divanı vardır. Nigari "Nigarrnamə", "Saqinamə", "Çaynamə" məsnəvilərini, o cümlədən məşhur sufi mütəfəkkiri Muyiddin Ərəbinin "Fütuhatı-Məkkiyə" əsərinə izahlar yazmışdır. Son zamanlar nigarişünaslığın deyə biləcəyimiz ədəbiyyat tədqiqatları yaranmışdır. Hazırda Nigari və ardıcıllarının həyat və yaradıcılığı daha dərindən öyrənilməkdədir. Mirzədə Mustafa Fəxrəddin Ağabalinin "Hümayi-ərş" əsərinin nəşr olunması bu istiqamətdə ilk mənbələrdəndir.

Şamaxı RİH-in başçısının müavini Qasım Qasımov da öz növbəsində simpoziumun ADPU-nun Şamaxı Filialında keçirilməsini mühüm hadisə kimi qiymətləndirərək gələn qonaqları salamladı və simpoziumun işinə uğurlar arzuladı.

Çıxış edən akademik İsa Həbibbəyli, akademik Muxtar İmanov, akademik Teymur Kərimli simpoziumun işini elmi cəhətdən çox yüksək qiymətləndirdilər və bütün iştirakçılara uğurlar arzuladılar.

Amasiya Azərbaycan Türkləri Kültür Sanat və Dayanışma Dərnəyinin başqanı Atilla Yaprak, Amasiya Universitetinin dosenti Metin Hakverdioğlu, İtaliya Yokoko Assosiasiyasından təşrif buyurmuş doktor Andrea Macchia, Makedoniya Universitetinin professoru Zoran Matevski, AMEA-nın Məhəmməd Fizuli adına Əlyazmalar İnstitutunun dosenti Nəzakət Məmmədli, Həmzə Nigari nəslindən olan qonaqlardan Siracəddin Həmidov və Müntəxab Mirsədizadə çıxış və məruzələr edərək Həmzə Nigarinin həyat və yaradıcılığından, beynəlxalq simpoziumun əhəmiyyətindən danışdılar.

ADPU-nun Şamaxı Flialının II tədris ili tələbəsi Heydər Sadıqovun balabanın müşayiəti ilə Həmzə Nigarinin "Qarabağ" tərcibəndini söyləməsi simpoziuma xüsusi rəng qatdı.

Plenar iclasın sonunda fəxri qonaqlara ADPU və onun Şamaxı Filialı adından hədiyyələr təqdim olundu və gələn qonaqlar da öz hədiyyələrini təqdim etdilər.

Sonra simpozium öz işini "Həmzə Nigari və sufizm", "Türk dünyası mədəni irsi", "Gənc alimlərin Sufizm və Türk dünyası mədəni irsi araşdırmaları" başlıqları altında üç bölmədə davam etdirdi. Bölmələrarası fasilədə iştirakçılar filialın həyətyanı sahəsi ilə tanış oldular və həzin musiqi sədaları altında təşkil olunmuş çay süfrəsinə dəvət olundular. Simpoziumun ilk günündə bölmə iclaslarından sonra qonaqlar Şamaxı rayonunda yerləşən Cümə məscidini və Tarix-Diyarşünaslıq Muzeyini ziyarət etdilər.

Növbəti gün simpozium öz işini başa çatdırdı və simpoziumun bağlanışında bölmə rəhbərlərinin hesabatları dinlənildi. Qeyd edildi ki, bölmələrdə çox maraqlı və aktual məqalələr müzakirə olundu. Simpoziumun keçirilməsi çox böyük əhəmiyyət daşıyır. Simpoziumda iştirak edən hər kəsə sertifikatlar və nəfis şəkildə tərtib olunmuş "III Beynəlxalq Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumu materialları" adlı kitab təqdim olundu.

Sonda filialın direktoru T.Yusifova simpoziumun yüksək səviyyədə təşkil olunmasında əməyi keçən hər kəsə təşəkkürünü bildirdi və xarici ölkələrdən gəlmiş qonaqlara simpoziumun gedişində çəkilmiş fotoşəkillərdən ibarət albom təqdim etdi. Simpoziumun bağlanışından sonra iştirakçılar Şamaxının tarixi əhəmiyyət daşıyan görməli yerlərini ziyarət etdilər.

# Ali məktəb müəllimlərinin I Forumu




Mayın 19-da Bakıda Azərbaycan ali məktəb müəllimlərinin "SABAH-ın müəllimi" adlı I Forumu keçirilib. Forum Təhsil Nazirliyinin SABAH qrupları, Azərbaycan Dövlət Pedaqoji Universiteti və "Microsoft" Şirkəti tərəfindən birgə təşkil olunub.

Tədbirdə çıxış edən Təhsil nazirinin müavini Ceyhun Bayramov deyib ki, forumun keçirilməsinin əsas məqsədi ali təhsil müəssisələri müəllimlərinin bilik, bacarıq və metodika ilə bağlı fikir mübadiləsi aparması və ali təhsilin müasir trendlərinin müzakirəsidir. Nazir müavini "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na uyğun olaraq müasir dünyanın yeni çağırışlarına və yüksək biliyə malik cəmiyyətin qurulması məqsədilə ali təhsil müəssisələrində yaradılmış SABAH qruplarının gənclər üçün yeni imkanlar açdığını bildirib. C.Bayramov forumun "Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi"ni rəhbər tutmaqla, müəllimləri qlobal meyillərə uyğun şəkildə yeni texnologiyaların inkişafına töhfə verməyə təşviq etmək, müəllimlərə dəstək olmaq məqsədilə keçirildiyini söyləyib. Nazir müavini vurğulayıb ki, bu tədris ilində Azərbaycanda 740-dan artıq SABAH qrupları tələbəsi məzun olacaq. Hazırda SABAH qrupları 11 ali təhsil müəssisəsində fəaliyyət göstərməklə, 45 ixtisas və 2300-dən artıq tələbəni və 600-dən artıq professor-müəllim heyətini əhatə edir. C.Bayramov deyib ki, Təhsil Nazirliyinin təşəbbüsü ilə 2014-2015-ci tədris ilində yaradılan SABAH layihəsinin əsas məqsədi ali təhsildə keyfiyyətin yüksəldilməsi, yeni və fərqli mühitin yaradılması, müasir tələblərə uyğun kadr hazırlığının təmin edilməsidir: "Son üç il ərzində SABAH qruplarında tədris aparmaq üçün müraciət etmiş namizədlərin sayı 4 dəfə artıb. 2014-2015-ci tədris ilində tədris aparmaq üçün müraciət etmiş müəllimlərin sayı 450 olduğu halda, 2016-2017-ci tədris il üçün bu rəqəm 1790 olub. Bu layihədə ən böyük rol müəllimlərin üzərinə düşür. SABAH qruplarına müəllimlər seçim əsasında seçilir. Bu qruplarda təhsil alan gənclərin də sonradan işlə təmin olunması vacib amil hesab edilir. Ötən il 38 xarici və dövlət şirkəti SABAH qruplarında təhsil alan 600 tələbəyə iş təklif edib".

Nazir müavininin sözlərinə əsasən, növbəti tədris ilindən bu qruplarda oxuyan tələbələr ikinci xarici dil olaraq alman dili tədris olunacaq: "Hazırda bu istiqamətdə danışıqlar aparılır".

C.Bayramov qeyd edib ki, son illər ölkədə müəllimlik ixtisasına maraq artıb. Onun sözlərinə görə, 2015 və 2016-cı illərdə 1000-dən çox məzun 500-dən yuxarı bal toplayaraq müəllimlik ixtisasını seçib: "Ölkədə test imtahanı tətbiq olunandan həmin dövrə qədər belə yüksək göstərici və seçim qeydə alınmayıb. Azərbaycan gənclərinin xaricdə təhsili üzrə Dövlət Proqramının 100-dən artıq məzunu bu gün ali məktəblərdə müəllim kimi fəaliyyət göstərir. Ötən il ölkədə müəllimlərin işə qəbulu üzrə müsabiqədə rekord sayda göstərici qeydə alınıb. Belə ki, 2016-cı ildə müəllimlərin işə qəbulunda 34 min namizəd yer tutmaq üçün müraciət edib. Təhsil Nazirliyi olaraq müəllimlərin fəaliyyəti üçün bütün şərait yaradılacaq ki, gənclər də onların potensialından faydalansın".

Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov SABAH qruplarında təhsilin inkişafı üçün görülən tədbirlərin əhəmiyyətindən, müəllimlərin davamlı elmi inkişafının aktuallığından danışıb. Rektor Cəfər Cəfərov bildirib ki, bu gün valideynlər övladlarını gələcəyin hədəflərinə uyğun yetişdirmək üçün yeni yollar və formullar axtarırlar. Kompüter, planşet və ağıllı telefonlarla bir arada uşaqları öyrətmək, tərbiyə etmək çox çətindir. Bu işin öhdəsindən gələ biləcək müəllim kadrların hazırlanması təhsil müəssisələrinin qarşısında yeni tələblər qoyur. Rektor deyib ki, ölkədə pedaqoji təhsilin inkişaf etdirilməsi, müasirləşdirilməsi dünyada baş verən dəyişikliklərə və yeniliklərə uyğun yenidən qurulması, müasir tələblərə cavab verməsi istiqamətində yeni addımların atılmasına və pedaqoji təhsilin keyfiyyətinin dünya göstəricilərinə uyğunlaşdırılmasına ehtiyac var. Bu hədəflərə nail olmaq üçün ali məktəbin üzərinə böyük öhdəliklər düşdüyünü deyən rektor qeyd edib ki, cəmiyyətin və dövlətin universitetdən haqlı gözləntiləri çoxdur.

Rektor vurğulayıb ki, yeni təhsil modelinin tətbiqi günün ən aktual probleminə çevrilib. Onun sözlərinə görə, müasir təhsilin hədəfi problemləri həll etmək bacarığına sahib, biliyi əldə etmək yollarını bilən, analitik düşüncə qabiliyyətinə malik olan mütəxəssislər yetişdirməkdir: "Son vaxtlar müəllim peşəsinə olan inamın yüksəldilməsi üçün müasir dövrün tələblərinə uyğun bilik və bacarığa malik müəllim yetişdirilməsi istiqamətində işlər həyata keçirilir".

Tədbirin davamında "Müasir trend və çağırışlar" adlı panel sessiya üzrə müzakirələr aparılıb.

# ADPU-nun elmi-tədqiqatları beynəlxalq müstəviyə qaldırılır

Məlumat üçün bildiririk ki, 24 may 2017-ci il tarixdə ADA Universitetində Azərbaycan və Rumıniya Ali Təhsil Müəssisələrinin Forumu keçirilmişdir. Təhsil nazirinin müavini Firudin Qurbanovun və Rumıniya Təhsil nazirinin müavini Gigel Paraskivin iştirakı ilə keçirilən Foruma Azərbaycanın 16 ali təhsil müəssisəsinin və Rumıniyanın 10 ali təhsil müəssisəsinin rəhbərləri, nümayəndələri qatılmışdır. Forumda ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Gülnar Xəlilova, ADPU-nun Rumıniyada mübadilə proqramı üzrə təhsil almış tələbələri və Filologiya fakültəsinin tələbələri iştirak etmişdirlər. Daha sonra Forumda iştirak edən Rumıniyanın Babeş-Bolyai Universitetinin Beynəlxalq əlaqələr şöbəsinin əməkdaşı və Avropaşünaslıq fakültəsinin elmi katibi xanım Ana Panteanın 25 may 2017-ci il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetində görüşü baş tutmuşdur.



ADPU-da keçirilən görüşdə Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə, Tədris işləri üzrə prorektor, professor Məlikməmməd Cəbrayılov, Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Gülnar Xəlilova, Tədqiqat və inkişaf şöbəsinin müdiri Şəhla Gülməmmədova və Beynəlxalq əlaqələr şöbəsinin əməkdaşları iştirak etmişdirlər.

Görüş zamanı prorektor Nigar Abbaszadə qonağa universitetin beynəlxalq əlaqələri haqqında qısa məlumat verərək, 31.05.2011-ci il tarixində ADPU-nun Rumıniyanın Babeş-Bolyai Universiteti ilə ikitərəfli əməkdaşlığının olduğunu, həmçinin ADPU-ya qoşulmuş AMİ-nin də həmin universitet ilə əməkdaşlıq etdiyini və EMİNENCE layihəsi çərçivəsində iki tələbənin Rumıniyada təhsil aldığını vurğuladı. Eyni zamanda Nigar Abbaszadə ADPU ilə Babeş-Bolyai Universiteti arasında ERASMUS+ çərçivəsində əməkdaşlıq əlaqələrinin genişlənəcəyinin əhəmiyyətini diqqətə çatdırdı.

Xanım Ana Pantea Babeş-Bolyai Universitetinin Rumıniyanın ən qədim universiteti olduğunu qeyd etdi, universitetin strukturu, fakültələri, tədris prosesinin həyata keçirilməsi, yeniliklər haqqında ətraflı məlumat verdi, iştirakçıların maraqlandıran sualları cavablandırdı.

Görüşdə iki ölkənin ali təhsil müəssisəsi arasında ERASMUS+ çərçivəsində tələbə və müəllim mübadiləsinin həyata keçirilməsi və digər əməkdaşlıq perspektivləri müzakirə edildi.

Sonda qonaq xanım Ana Pantea səmimi və işgüzar görüşə görə öz minnətdarlığını bildirdi, əməkdaşlıq əlaqələrinin genişlənəcəyini əminliklə ifadə etdi.

## Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində rektor Cəfər Cəfərovun “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” məqaləsinin seminar-müzakirəsi

Mayın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində universitetin rektoru, professor Cəfər Cəfərovun “Xalq qəzeti”ndə 13 may 2017-ci il-



də dərc edilmiş “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” adlı məqaləsinin seminar-müzakirəsi keçirilib.

Seminar-müzakirəni fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva giriş sözü ilə açaraq universitetin rektoru, pofessor Cəfər Cəfərovun xalqımızın ümummilli lideri, ulu öndəri Heydər Əliyevin Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası haqqında “Xalq qəzeti”ndə dərc olunan məqaləsi haqqında ətraflı çıxış etdi və məqalədə irəli sürülən məsələlər barədə toplantı iştirakçılarını məlumatlandırdı. Qeyd etdi ki, ümummilli lider Heydər Əliyev həmişə təhsilə, tərbiyəyə strateji sahə kimi baxmışdır: “Təhsil sahəsi xalqımızın bu günü, millətimizin, dövlətimizin gələcəyi üçün ən vacib bir sahədir”. Hörmətli rektorumuzun adıçəkilən məqaləsi də məhz Heydər Əliyev ideyalarından qaynaqlanıb. Məqalənin məzmunundan danışarkən Ş.Əliyeva son bir ildə ADPU-da təhsilin inkişafı istiqamətində görülmüş işlər haqqında geniş şərh verdi. Dekan Ş.Əliyeva hazırda universitetdə uğurla həyata keçirilən islahatlardan ətraflı danışdı və bildirdi ki, universitetdə aparılan islahatlar təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət edir.

Ümumi psixologiya kafedrasının müəllimi, psixologiya üzrə fəlsəfə doktoru Səbinə Əlizadə bildirdi ki, görkəmli dövlət xadimi, ümummilli lider Heydər Əliyevin möhtəşəm idarəçilik və dövlətçilik fəaliyyətində təhsil məsələləri xüsusi yer tutur. Ulu Öndərimiz ölkənin və xalqın taleyində, hərtərəfli tərəqqisində, uğurlar qazanmasında təhsilin xüsusi rolunu, əhəmiyyətini həmişə nəzərə almış, yüksək qiymətləndirmişdir. Ulu Öndər deyirdi: “Həyat böyük bir prosesdir. Bu prosesdə uğurla iştirak etmək üçün insan müasir tələblərə cavab verən təhsilə malik olmalıdır”.

Professor Ərəstun Baxşəliyev, professor Ramiz Əliyev, professor Müseyib İlyasov, dosent Edison Quliyev , baş müəllim Lamiyə Qurbanova və başqaları çıxış edərək Heydər Əliyevin təhsil siyasətinin ADPU-da uğurla həyata keçirilməsini yüksək dəyərləndirdilər.

Seminar-müzakirə işgüzar şəraitdə davam etdi və ruh yüksəkliyi ilə başa çatdı.

## Filologiya fakültəsində rektor Cəfər Cəfərovun “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” məqaləsinin seminar-müzakirəsi

Mayın 18-də Filologiya fakültəsində universitetin rektoru, professor Cəfər Cəfərovun mayın 13-də “Xalq qəzeti”ndə dərc olunmuş “Heydər Əliyev və Azər-



baycan təhsilinin milliləşdirilməsi strategiyası” adlı məqaləsinin seminar-müzakirəsi keçirildi. Seminarda rektorun müşaviri, professor Vilayət Əliyev, fakültənin dekanı, professor Buludxan Xəlilov, kafedra müdirləri, fakültənin professor-müəllim heyəti və tələbələri iştirak etdilər.

Seminar-müzakirəni giriş sözü ilə açan professor Buludxan Xəlilov qeyd etdi ki, rektor Cəfər Cəfərovun adıçəkilən məqaləsində ulu öndər Heydər Əliyevin Azərbaycan təhsilinə göstərdiyi diqqət və qayğı, təhsildəki inkişaf prosesləri, təhsil müəssisələrinin, o cümlədən universitetimizdə tədrisin təşkilində və idarəçiliyində baş verən böyük dəyişiklik və yeniliklər, dövlət səviyyəsində qəbul olunmuş qərarlar öz əksini tapmışdır. Məqalədə həmçinin Təhsil Nazirliyinin “Açıq qapı günləri” layihəsi çərçivəsində universitetimizdə ümumi təhsil məktəblərinin direktorları, müəllim və şagirdləri ilə keçirilən görüşlərdən, universitetimizə dəvət olunan müəllimlərin ustad dərslərindən bəhs olunur. Eyni zamanda məqalədə qeyd olunub ki, bu sahədə həyata keçirilən zəruri tədbirlər, atılan uğurlu addımlar, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən imzalanan sərəncam və fərmanlar təhsilin keyfiyyətinin yüksəlməsinə səbəb olmuşdur. Daha sonra seminar-müzakirənin iştirakçıları məqalənin aktuallığından, həmçinin fakültədə elm və təhsil sahəsində görülən işlər, həyata keçirilən tədbirlərlə bağlı öz fikirlərini bildirdilər.

## 28 May - Respublika Günü münasibətilə tədbir



Mayın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 28 May- Respublika Günü münasibətilə tədbir keçirilib. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib. Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, 1918-ci il mayın 28-də yaranan Azərbaycan Xalq Cümhuriyyəti qısa müddət yaşamasına baxmayaraq, xalqımızın, millətimizin tarixində önəmli rol oynayıb. Qeyd edib ki, bu tədbirimizdə xalqımızın vətənpərvər və millətsevər oğlu, Azərbaycan Xalq Cümhuriyyətinin qurucularından biri olan Məhəmməd Əmin Rəsulzadənin nəvəsi Rəis Rəsulzadə iştirak edir. Azərbaycan Xalq Cümhuriyyəti ictimai-siyasi fikir tariximizdə, dövlətçilik tariximizdə böyük rol oynayıb. Ötən əsrin 80-ci illərinin sonları, 90-cı illərinin əvvəllərində SSRİ-nin zəifləməsi müttəfiq respublikalarda milli-azadlıq mübarizəsinin güclənməsinə təkan verdi. Azərbaycan yenidən öz dövlət müstəqilliyini bərpa etdi. Bayrağımız, himnimiz, gerbimiz yenidən bərpa edildi. Lakin müstəqilliyimizin ilk illəri çox çətin və mürəkkəb şəraitdə keçdi. Yalnız ulu öndər Heydər Əliyevin zəngin idarəçilik və dövlətçilik təcrübəsi, siyasi uzaqgörənliyi, iradə və qətiyyəti nəticəsində Azərbaycan öz dövlət müstəqilliyini qoruyub saxlaya bildi. Məhz ulu öndər Heydər Əliyev müstəqil Azərbaycan dövlətini qurdu, gücləndirdi, dünya miqyasında tanıtdı. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev müstəqil dövlətimizin daha da gücləndirilməsi, davamlı sosial-iqtisadi inkişafının təmin edilməsi və beynəlxalq siyasi nüfuzunun yüksəldilməsi üçün çoxşaxəli səmərəli fəaliyyət həyata keçirir. Azərbaycan öz müstəqilliyinin 26-cı ilini yaşayır. Biz müstəqil dövlətin vətəndaşı olmaqdan qürur duyuruq. Müstəqil dövlətimizi göz-bəbəyimiz kimi qorumaq bizim hər birimizin, xüsusilə də, gənclərin müqəddəs borcudur.

Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova “Müstəqil Azərbaycan Respublikası Azərbaycan Xalq Cümhuriyyətinin siyasi və mənəvi varisidir” mövzusunda məruzə ilə çıxış edib. Dosent N.Əhmədova Azərbaycan Xalq Cümhuriyyətinin yaranması və fəaliyyət göstərdiyi tarixi-siyasi şərait barədə ətraflı məlumat verib. Bildirib ki, XIX əsrin sonları - XX əsrin əvvəllərində Azərbaycanın ictimai-siyasi və mədəni inkişafı Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasına gətirib çıxardı. 1918-ci il mayın 28-də Tbilisidə Azərbaycan Milli Şurası «İstiqlal Bəyannaməsi»ni qəbul etdi. 24 səslə qəbul edilən və 6 bənddən ibarət olan Bəyannamə Azərbaycan xalqının varlığını bütün dünyaya yaydı. Hüquqi və siyasi sənəd olan Bəyannamədə müstəqil Azərbaycan dövlətinin yarandığı göstərilmiş, onun hakimiyyətinin əhatə etdiyi ərazinin hüdudları müəyyənləşdirilmiş və dövlətin əsas prinsipləri öz əksini tapmışdır. «İstiqlal Bəyannaməsi»ndə demokratik dövlətin əsas atributları sayılan hakimiyyətin xalqa məxsus olması, vətəndaşların mülki və siyasi hüquqlarının təminatı, bütün xalqların və hər bir kəsin milli və dini mənsubiyyətindən asılı olmayaraq, azad inkişafı üçün şəraitin yaradılması, həmçinin hakimiyyət bölgüsü prinsipləri hüquqi cəhətdən təsbit edilmişdi.

23 aylıq hakimiyyəti dövründə Azərbaycan Xalq Cümhuriyyəti çox ağır və mürəkkəb bir tarixi-siyasi şəraitdə fəaliyyət göstərmişdir. Lakin buna baxmayaraq, Azərbaycan Xalq Cümhuriyyəti öz dövlətçilik atributlarını qəbul etmiş, dövlət və hərbi quruculuq, iqtisadiyyat və mədəniyyət, təhsil və səhiyyə sahələrində mühüm əhəmiyyət kəsb edən ciddi addımlar atmışdır. Bugünkü müstəqil və güclü, hərtərəfli inkişaf etmiş Azərbaycan Respublikası məhz Azərbaycan Xalq Cümhuriyyətinin siyasi və mənəvi varisidir. Qədirbilən xalqımız Cümhuriyyət liderlərinin xatirəsini əziz tutur. Azərbaycanın dövlət müstəqilliyi xalqımızın ən böyük tarixi nailiyyəti, ən əziz, ən qiymətli sərvətidir.

Fizika və texnologiya fakültəsinin Ümumi fizika kafedrasının professoru Vaqif Nəsirov, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müəllimi, tarix üzrə fəlsəfə doktoru Taleh Cəfərov çıxış edərək Azərbaycan Xalq Cümhuriyyətinin dövlətçilik tariximizin xüsusi şərəfli bir səhifəsi olduğunu, dövlət quruculuğu sahəsində mühüm qərarlar qəbul etdiyini, parlamentarizm ənənələrini formalaşdırdığını, idarəetmənin hüquqi əsaslarını yaratdığını, müstəqil dövlətçiliyimizin hüquqi, siyasi, ideoloji mədəni və tarixi əsaslarının müəyyənləşdirilməsində böyük rol oynadığını qeyd ediblər.

Tədbir çıxışlarla başa çatıb.

**Mahirə Məhərrəmqızı**

## Tarix və coğrafiya fakültəsində rektor Cəfər Cəfərovun “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” məqaləsinin seminar-müzakirəsi



Mayın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev Mərkəzində Tarix və coğrafiya fakültəsinin təşkilatçılığı ilə ADPU-nun rektoru, professor Cəfər Cəfərovun “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” adlı məqaləsinin geniş müzakirəsi keçirildi. Seminarı giriş sözü ilə açan fakültənin dekanı, dosent Şahin Pənahov qeyd etdi ki, hörmətli rektor, professor Cəfər Cəfərovun “Xalq qəzeti”nin 13 may 2017-ci il tarixli sayında dərc olunmuş “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” məqaləsi nəinki Azərbaycanda, eyni zamanda keçmiş Sovetlər Birliyinin aparıcı dövlət xadimlərindən olan Azərbaycan xalqının böyük oğlu, dahi Heydər Əliyevin təhsil sahəsindəki çoxşaxəli fəaliyyətinə həsr olunmuşdur. Seminarın keçirilməsində əsas məqsəd sözügedən məqalədə toxunulan vacib məsələlərə münasibət bildirmək, 40 ildən çox bir dövrdə lider olan Heydər Əliyevin təhsil siyasətinə bir daha nəzər salmaqdır.

Məqalə ilə bağlı dəyərli fikirlər səsləndirən dosent Ş.Pənahov məqalədə qaldırılan vacib məsələlərə münasibətini bildirdi. O, dahi Heydər Əliyevin çalışdığı bütün sahələrdə böyük xidmətlər göstərdiyini diqqətə çatdırdı. Ulu Öndərin həm sovet dövründə, həm müstəqillik illərindəki yorulmaz fəaliyyətindən, intellektual potensialın inkişafı istiqamətindəki gördüyü işlərdən ətraflı bəhs etdi.

Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayev çıxış edərək bildirdi ki, ölkənin davamlı inkişaf sürətinə uyğun olaraq həyata keçirilən islahatların mühüm tərkib hissəsini elm, təhsil və mədəniyyət sahəsində baş verən yeniliklər təşkil edir. Yeniliklərin əsas istiqamətlərindən biri isə ölkəmizin siyasi, sosial-iqtisadi inkişafına uyğun Heydər Əliyev tərəfindən müəyyənləşdirilmiş təhsil strategiyasının həyata keçirilməsi, bu xüsusda müstəqil, yaradıcı düşünən vətəndaş və şəxsiyyət formalaşdırmaqdan ibarətdir. Məhz bu mühüm məqsədin nəzəri və praktik cəhətdən reallaşdırılmasını özündə ehtiva edən, ADPU-nun rektoru, professor Cəfər Cəfərovun “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” adlı məqaləsi xüsusi önəm daşıyır. İ.İsayev professor C.Cəfərovun Ulu Öndərin Azərbaycan təhsilinin gələcək inkişaf təmayülləri haqqında fəlsəfi düşüncələrini təhlil edərək onu dəyərləndirdiyini, bir rəhbər işçi kimi əməli fəaliyyətində ona sadiqliyini ifadə etdiyini dilə gətirdi.

Məqalədə diqqəti cəlb edən məqamlardan biri müəllifin Heydər Əliyevin ümumən proqram xa-rak-terli müddəala-rına kompleks yanaşaraq Ulu Öndərin təhsil kon-sepsiyasının tərkib hissələrini müəyyənləşdirməsi, onun mahiyyətinin milli-mənəvi dəyərlərə söykənən, keçmiş təhsilin mütərəqqi ənənə-ləri üzə-rində qurulmuş, dünya təhsilinin qabaqcıl təc-rübəsindən qaynaqlanan vətəndaş yönümlü milli təhsil quruculuğunun həyata keçirilməsi təşkil etdiyini söyləməsidir. Məqalədə həmçinin dövlətin milli təhsil konsepsiyasını işləyib-hazırlayan Ulu Öndərin çevik təfəkkür tərzinə malik yeni insanın formalaşmasında milli tərbiyəyə xüsusi diqqət yetirdiyi oxucuya təqdim edilir. Müəllif fikirlərini Ümummilli Liderin “Dünya təcrübəsindən Azərbaycanın milli xüsusiyyətlərinə uyğun prinsiplər, qaydalar təhsil sistemində tətbiq edilməlidir” müddəası ilə təsdiqləyir.

Sonda professor İ.İsayev bildirdi ki, məqalədə diqqətələyiq məsələlərdən ən başlıcası məhz Heydər Əliyevin təhsil konsepsiyasına əsaslanan “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda 5 istiqamət üzrə əməli fəaliyyətin ADPU-nun timsalında ümumiləşdirilməsinə yer verilməsidir.

Seminarda Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova məqalənin əsas məziyyətlərindən bəhs etdi, təhsil siyasəti ilə bağlı irəli sürülən əsas müddəalardan danışdı. Çıxışçı ümummilli lider Heydər Əliyevin Azərbaycana istər birinci, istərsə də ikinci rəhbərliyi dövründə daim təhsilə, tərbiyəyə strateji sahə kimi baxdığını, Vətənin, xalqın tərəqqisində onların roluna yüksək qiymət verdiyini vurğuladı, XX əsrin 70-ci illərindən başlayaraq hər il yüzlərlə azərbaycanlı gəncin keçmiş Sovet İttifaqının aparıcı ali məktəblərinə müxtəlif ixtisaslar üzrə təhsil almağa göndərilirdiyini seminar iştirakçılarının diqqətinə çatdırdı. Dosent N.Əhmədova ADPU-da istər təhsil, istər elm sahəsində aparılan böyük işlərdən də danışdı. Sürətlə müasirləşən Azərbaycan Respublikasında təhsilin keyfiyyət göstəricilərinin Avropa standartlarına uyğunlaşdırılması sahəsində ADPU-da mühüm işlərin görüldüyündən bəhs etdi, təhsilin keyfiyyətini artırmaq məqsədilə pedaqoji kadr hazırlığına, kadr potensialının yüksək peşəkarlıq səviyyəsinə xüsusi önəm verildiyini bildirdi.

Seminarda çıxış edən Ümumi pedaqogika kafedrasının dosenti Kəmalə Quliyeva “Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası” adlı məqaləsini yüksək qiymətləndirdi, məqalədə təhsil strategiyası ilə bağlı mühüm məsələlərə toxunulduğunu diqqətə çatdırdı. Məqalədə kadr hazırlığı ilə bağlı Heydər Əliyev strategiyasının mühüm aspektlərinin çox məzmunlu, məntiqli şəkildə vurğulandığı qeyd olundu. Bununla yanaşı, təhsil sahəsində həyata keçirilən mühüm hüquqi-normativ sənədlərdən, qarşıya qoyulan strateji hədəflərdən də bəhs olundu. Azərbaycan Respublikasının Prezident möhtərəm cənab İlham Əliyevin Ümummilli Liderin təhsil sahəsində yaratdığı hüquqi-normativ bazanı daha da təkmilləşdirdiyi seminar iştirakçılarının diqqətinə çatdırıldı.

Qarşılıqlı debat şəklində keçən seminar öz işini uğurla başa vurdu.

**Nigar Aslanova,**
**ADPU-nun Heydər Əliyev Mərkəzinin müdiri**

## Riyaziyyat və informatika fakültəsində rektor Cəfər Cəfərovun "Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası" məqaləsinin seminar-müzakirəsi



Ümummilli lider Heydər Əliyev həmişə elm və təhsilə strateji sahə kimi baxmışdır. Ulu Öndər demişdir: "Təhsil sahəsi xalqımızın, millətimizin bu günü, dövlətimizin gələcəyi üçün ən vacib bir sahədir. Təhsil millətin gələcəyidir". Ulu Öndərin çoxşaxəli və zəngin idarəçilik və dövlətçilik fəaliyyətində təhsil məsələləri mühüm yer tuturdu. Qeyd edək ki, professor Cəfər Cəfərovun təhsilimizin inkişaf tarixini və hazırkı vəziyyətini qiymətləndirən "Heydər Əliyev və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası" adlı məqaləsi ictimaiyyət tərəfindən böyük maraqla qarşılanmışdır.

Mayın 19-da Riyaziyyat və informatika fakültəsində universitetin rektoru, professor Cəfər Cəfərovun mayın 13-də "Xalq qəzeti" ndə dərc olunmuş "Heydər Əliyev  və Azərbaycan təhsilinin milliləşdirilməsi strategiyası" adlı məqaləsinin seminar-müzakirəsi keçirildi. Seminarda rektorun müşaviri, professor Vilayət Əliyev, fakültənin dekanı, riyaziyyat üzrə elmlər doktoru, dosent Maqsud Nəcəfov, kafedra müdirləri, fakültənin professor-müəllim heyəti və tələbələri iştirak etdilər. Maqsud Nəcəfov qeyd etdi ki, rektor Cəfər Cəfərov dərin məzmunlu və yüksək səviyyəli bu məqaləsində Ulu Öndərin Azərbaycan təhsilinə göstərdiyi diqqət və qayğıdan, bu sahədə dövlət səviyyəsində qəbul olunmuş qərarlardan, təhsil islahatlarından, bu islahatların təkamül yolu ilə həyata keçirilməsindən, təhsildə qazanılan uğurlardan, milli təhsil sistemimizin dünya təhsil sistemi ilə əlaqələrindən, universitetin tədris və idarəçiliyində baş verən dəyişikliklərdən ətraflı bəhs etmişdir.

Tədbirdə rektorun müşaviri, professor Vilayət Əliyev, Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Azadxan Adıgözəlov, Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova, Riyazi analiz kafedrasının müdiri, dosent Bəhram Əliyev, Hesablama riyaziyyatı və informatika kafedrasının müdiri, dosent Zemfira Tağıyeva, Cəbr və həndəsə kafedrasının müdiri, dosent Zahirəli Sadıxov çıxış edərək məqalənin müasir dövrümüz üçün aktual olduğunu və yüksək elmi məzmun kəsb etdiyini bildirdilər.

## ADPU-nun Ağcabədi Filialında ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş elmi-praktik konfrans



Mayın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr olunmuş "Heydər Əliyev keçmişi qoruyan, gələcəyi quran liderdir" mövzusunda elmi-praktik konfrans keçirildi.

Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent  Mətanət Fərzəliyeva bildirdi ki, bu günlər respublikamızda Azərbaycan xalqının xilaskarı, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü münasibətilə silsilə tədbirlər həyata keçirilir. Biz də öz növbəmizdə ADPU-nun Ağcabədi Filialı olaraq ulu öndərimiz Heydər Əliyevin əziz xatirəsinə həsr olunmuş bir sıra tədbirlər həyata keçirmişik ki, bugünkü elmi-praktik konfrans da həmin tədbirlərdən biridir.

Ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Sonra məruzələr dinlənildi.

"Heydər Əliyev keçmişi qoruyan, gələcəyi quran liderdir" mövzusunda məruzə ilə çıxış edən filialın dosent əvəzi T.Kərimli bildirdi ki, Azərbaycan xalqının tarixində və taleyüklü məsələlərinin həllində müstəsna xidmətləri olan tarixi şəxsiyyətlər, görkəmli siyasət və dövlət adamları çox olmuşdur. Onlar zaman-zaman gördükləri böyük işləri və əməlləri ilə yadda qalmışlar. Belə tarixi şəxsiyyətlər arasında görkəmli dövlət xadimi, dünya miqyaslı siyasətçi Heydər Əliyevin xüsusi yeri və rolu vardır. Çünki dövlət xadimlərimizdən ancaq bu dahi şəxsiyyət milli lider səviyyəsinə yüksələ bilmişdir.

Ümummilli liderimiz Heydər Əliyevin öz xalqına misilsiz xidmətlərindən danışan məruzəsi onun demokratik, hüquqi və dünyəvi dövlət quruculuğu işində yürütdüyü məqsədyönlü siyasətin əhəmiyyətini açıqladı. Qeyd etdi ki, bu siyasəti Ulu Öndərimizin layiqli varisi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev uğurla davam etdirir.

T.Kərimli məruzəsinin sonunda ümummilli liderimiz Heydər Əliyevə sonsuz məhəbbət və ehtiramını ifadə edərək Onun işıqlı əməllərinin daim yaşayacağını bildirdi.

Növbəti məruzə üçün söz filialın baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Ə.Nəcəfova verildi. "Müstəqilliyimizin ilk illərində Azərbaycan mədəniyyətinin inkişafında Heydər Əliyevin rolu" mövzusunda məruzə edən Ə.Nəcəfov bildirdi ki, ümummilli lider Heydər Əliyev gənc nəslin milli ruhda tərbiyə olunmasını əsas amillərdən biri kimi qiymətləndirmiş və gənclərimizin Azərbaycan tarixini, mədəniyyətini və ədəbiyyatını dərindən öyrənmələrini tövsiyə etmişdir.

Daha sonra məruzə üçün söz filialın müəllimi A.Əlizadəyə verildi.

"Heydər Əliyev və milli-mənəvi dəyərlər" mövzusunda məruzə edən A.Əlizadə ümummilli liderimiz Heydər Əliyevin tarixi şəxsiyyət kimi siyasi fəaliyyətindən, bəşəriyyətə nümunə olunacaq davranışlarından ürəkdolusu danışdı. Məruzəçi gənc nəslə ən böyük örnək olan Heydər Əliyev şəxsiyyətinin ayrı-ayrı komponentlərindən bəhs etdi və bildirdi ki, Onun yüksək mənəvi keyfiyyətlərə sahib olması xarakterindəki bütövlük, şəxsiyyətinin davamlılığı və Vətəninə, xalqına sədaqəti ilə müəyyənləşir. Odur ki, Vətəni və xalqı Heydər Əliyev kimi sevmək, milli-mənəvi dəyərlərimizə sahib çıxmaq gərəkdir.

Sonra məruzələr ətrafında çıxışlar dinlənildi.

"Heydər Əliyev və Azərbaycan təhsili" adlı məqalə ilə çıxış edən filialın dosenti M.Hüsyenov ulu öndərimiz Heydər Əliyevin Azərbaycan təhsilinə göstərdiyi diqqət və qayğıdan danışdı. Heydər Əliyevin milli təhsil və tərbiyə məsələlərinə dair nəzəri konsepsiyasını yüksək qiymətləndirən M.Hüseynov bu konsepsiyanı hər bir təhsilalanın, hər bir pedaqoqun, ümumən, hər bir Azərbaycan vətəndaşının fəaliyyət devizi, həyat amalı adlandırdı.

"Heydər Əliyev və milli dəyərlər" adlı məqalə ilə çıxış edən filialın tələbəsi N.Ağayeva xalqımızın ümummilli lideri Heydər Əliyevin milli-mənəvi dəyərlərimizin qorunmasında, xalqın milli özünüdərki sahəsində gördüyü işlərdən danışdı. N.Ağayeva Heydər Əliyevi mənəvi-əxlaqi keyfiyyətlərinə və siyasi addımlarına görə məğlubedilməz bir sərkərdəyə bənzətdi. Qeyd etdi ki, Heydər Əliyev kimi məğlubedilməz sərkərdəsi olan xalq həmişə yaşayacaq və öz dəyərli oğullarını əbədiyyət evinədək yaşadacaqdır.

Konfransda yekun sözü ilə çıxış edən dosent M.Fərzəliyeva bildirdi ki, bu gün biz ulu öndərimiz Heydər Əliyevin şərəfli və mənalı həyat yoluna nəzər salanda görürük ki, Onun bir lider, ictimai-siyasi xadim kimi fəaliyyəti mənsub olduğu xalqın taleyi ilə sıx bağlı olmuş, xalqının azadlığı, rifahı və müstəqil dövlətçiliyi üçün var gücü ilə çalışmışdır. Biz öz işimizlə Ulu Öndərin siyasi kursuna sədaqət nümayiş etdirəcəyimizə söz veririk.

## ADPU-nun Quba Filialında ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümünə həsr edilən silsilə tədbirlər keçirilmişdir




Ümummilli lider Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında silsilə tədbirlər keçirilmiş, filialın müəllim və tələbələri bu münasibətlə həm rayon miqyasında, həm də respublika miqyasında keçirilən tədbirlərdə fəal iştirak etmişlər. Belə ki, TGT-nin sədri İlkin Xanlarzadə mayın 3-də Dövlət Təhlükəsizliyi Xidmətinin (DTX), Heydər Əliyev Mərkəzinin, Təhsil Nazirliyinin, Gənclər və İdman Nazirliyinin, Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin, Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun birgə təşkilatçılığı ilə "Heydər Əliyev-dövlət təhlükəsizlik orqanlarının ilk azərbaycanlı generalı" mövzusunda keçirilmiş ümumrespublika konfransında "Dərin bilik, sarsılmaz iradə və bənzərsiz fəaliyyət qabiliyyəti Heydər Əliyev fenomeninin əsas cəhətləridir " mövzusunda çıxış etmişdir.

Mayın 4-də filialda "Heydər Əliyev və təhsilimiz" mövzusunda elmi-praktik konfrans keçirilmiş, konfransda Ümummilli Liderin təhsilimizin inkişafı, dünyaya inteqrasiyası üçün gördüyü işlərdən, Onun çoxşaxəli fəaliyyətindən ətraflı bəhs edilmişdir. Konfransdan sonra filialın kollektivi Quba şəhərində yerləşən Heydər Əliyev Mərkəzini ziyarət etmiş, Ulu Öndərin həyat və fəaliyyətini əks etdirən şəkillərə, videoçarxa baxmışlar.

Mayın 5-də ulu öndər Heydər Əliyevin anadan olmasının 94-cü ildönümü münasibətilə Quba Rayon İcra Hakimiyyətinin (RİH) təşkilatçılığı ilə Yeni Azərbaycan Partiyasının (YAP) Quba rayon təşkilatının ətrafındakı ərazidə keçirilən ağacəkmə aksiyasında və təşkilatın akt zalında "Heydər Əliyev müasir Azərbaycanın memarı və qurucusudur" mövzusunda keçirilmiş elmi-praktik konfransda filialın direktoru, professor Əli Allahverdiyev "Heydər Əliyev və xarici siyasətin balanslaşdırılması" və filialın tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva "Heydər Əliyevin gənclər siyasəti" mövzularında çıxış etmişlər.

Həmçinin mayın 5-də Quba RİH-in və Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun təşkilatçılığı ilə Heydər Əliyev Mərkəzində "Heydər Əliyev və Azərbaycan mətbuatı" mövzusunda keçirilmiş seminarda filialın TEC-nin fəalları iştirak etmişlər.

Mayın 6-da isə filialın Tələbə Gənclər Təşkilatının (TGT) fəalları ilə Quba şəhər Heydər Əliyev Mərkəzinin rəhbərliyinin birgə təşkil etdiyi tədbirdə tələbələr Heydər Əliyevin həyat və siyasi fəaliyyəti ilə daha yaxından tanış olmuşlar.

## Tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının attestasiyası

Xəbər verdiyimiz kimi, hazırda Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) kafedralarda tədris olunan fənlər üzrə vakant professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün müsabiqə keçirilir. Bununla yanaşı, mayın 25-dən başlayaraq ADPU-da tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının da attestasiyasının keçirilməsinə başlanılıb. Belə ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərov "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın tələblərini, "Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulması barədə" Azərbaycan Respublikası Prezidentinin Sərəncamından irəli gələn müddəaları, eləcə də Əmək Məcəlləsini və "Təhsil haqqında" Qanunu əsas tutaraq universitetdə çalışan tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının peşəkarlıq səviyyəsinin yoxlanılması, onların ixtisasına müvafiq olaraq tutduğu vəzifəyə (peşəyə) uyğunluğunun müəyyənləşdirilməsi və kadr potensialından səmərəli istifadənin təmin olunması məqsədilə müvafiq əmr imzalayıb. Əmrdə ADPU-da tədris-yardımçı heyətdə və Kitabxana-İnformasiya Mərkəzində çalışan, qanunvericiliklə attestasiyadan keçməli olan bütün işçilərin attestasiyasının keçirilməsi öz əksini tapıb. Həmin əmrə əsasən tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının attestasiyasının təşkili və keçirilməsi üçün tanınmış və nüfuzlu təhsil ekspertləri, Əməkdar elm xadimi, professor Şahlar Əsgərov, Təhsil Şurasının sədri, Əməkdar müəllim, professor Əjdər Ağayev, həmçinin Zaur Bağırov, Vaqif Əliyev, Qumral Qədimova, Razim Məmmədov, İradə Əliyeva və Zakir Nağıyevin daxil olduğu attestasiyasiya komissiyası yaradılıb. Komissiya öz fəaliyyətini Əmək Məcəlləsinə, Nazirlər Kabinetinin "Azərbaycan Respublikasında işçilərin attestasiyasının keçirilməsi Qaydaları"na uyğun həyata keçirir. Əmrin icrası ilə əlaqədər universitetin İnsan resursları şöbəsi Həmkarlar İttifaqı Komitəsi və hüquqşünasla birlikdə attestasiyadan keçməli olan əməkdaşların siyahısını hazırlayıb komissiyaya təqdim edib. Bütövlükdə attestasiyaya 240 nəfər cəlb edilib. Attestasiya müsahibə formasında keçirilir. Qeyd etmək lazımdır ki, universitetin İnsan resursları şöbəsi tərəfindən bir müddət öncə tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının bilik və peşəkarlıq səviyyəsinin müəyyən edilməsi məqsədilə ikimərhələli yoxlama keçirilib. Birinci mərhələdə onların informasiya-kommunikasiya texnologiyaları sahəsində bilik və bacarıqları yoxlanılıb. Yazılı qaydada aparılan ikinci mərhələdə isə onların ümumi elmi-nəzəri səviyyəsi, ixtisas bilikləri, eyni zamanda qanunvericiliklə bağlı bilikləri, məntiqləri, dünyagörüşləri yoxlanılıb. Onu da qeyd edək ki, tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının imtahan zamanı göstərdikləri nəticələr attestasiya zamanı nəzərə alınacaq. ADPU-nun rektoru, professor Cəfər Cəfərov həm müsabiqənin, həm də attestasiyanın qanun çərçivəsində, şəffaf və obyektiv keçirilməsinə ciddi nəzarət edir.

## Beynəlxalq əlaqələr genişlənir



Rusiya Federasiyasının Ufa şəhərində 17-19 may 2017-cil il tarixlərdə Rusiya və Azərbaycan ali təhsil müəssisələri Assosiasiyasının II Forumu keçirilmişdir. II Forumda Azərbaycan Respublikası Təhsil nazirinin müavini Mətin Eynullayev, Aparat rəhbərinin müavini Yaqub Piriyev, Beynəlxalq əməkdaşlıq şöbəsinin müdiri Muxtar Məmmədov, ADNSU-nun rektoru, professor Mustafa Babanlı, BMU-nun rektoru, professor Havar Məmmədov, SDU-nun rektoru, Assosiasiyanın həmsədri, professor Elxan Hüseynov, ATU-nun rektoru Akif Süleymanov, LDU-nun rektor əvəzi, professor Natiq İbrahimov, BDU-nun prorektoru, professor İradə Əliyeva, ADPU-nun prorektoru, professor Asəf Zamanov, ADMİU-nun prorektoru, dosent Validə Məmmədova, AMİU-nun prorektoru, dosent Nərgiz Abdullayeva, NDU-nun prorektoru, dosent Mübariz Nuriyev və digər ali məktəblərin nümayəndələri, həmçinin Rusiya Federasiyasının 30-a qədər ali məktəbinin rəhbərləri, Başqırdıstanın Baş Nazirinin müavini, Təhsil naziri iştirak edirdilər. Forum çərçivəsində "Ali məktəblərin beynəlxalq əməkdaşlığı dövlətin inkişafının əsas amili kimi", "Peşəkar təhsilin inkişafının Milli Strategiyaları və universitetlərarası əməkdaşlığın inkişafı məsələləri" nə həsr edilmiş məruzələr dinlənilib müzakirə edilmişdir. Rusiya Federasiyası və Azərbaycan Respublikası ali təhsil müəssisələri Assosiasiyasının və Xəzəryanı ölkələrin ali məktəblərinin Assosiasiyasının əməkdaşlığına dair "Ufa deklarasiyası" qəbul edilmişdir. Forum iştirakçıları Başqırdıstan Dövlət Pedaqoji Universitetinin və Ufa Dövlət Neft-Texniki Universitetinin fəaliyyəti ilə də tanış olmuşlar. Rusiya Federasiyası və Azərbaycan Respublikası universitetləri, o cümlədən Başqırdıstan Dövlət Pedaqoji Universiteti ilə Azərbaycan Dövlət Pedaqoji Universiteti arasında elm, təhsil və mədəniyyət sahəsində əməkdaşlığa dair müqavilə imzalanmışdır. BDPU ilə ADPU arasındakı müqaviləni universitetlərin elmi işlər üzrə prorektorları, professor Lyudmila Amirova və professor Asəf Zamanov imzalamışlar. Müqavilədə universitetlərin elmi və rəhbər kadrlarının, professor-müəllim heyətinin təcrübə mübadiləsi, qarşılıqlı maraqdoğuran sahələrdə tədqiqat layihələrinin birgə yerinə yetirilməsi, beynəlxalq elmi simpozium, konfrans və seminarların təşkili, hər iki universitetin mövcud maddi-texniki bazasından birgə istifadə, həmçinin birgə təhsil proqramlarının həyata keçirilməsi nəzərdə tutulmuşdur.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dilçiliyi kafedrasının dosenti Həcər Hüseynovaya anası

**Minayə Bayramovanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1581
Sayı: 1500
Çapa imzalanıb: 31.05.2017-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.